

*Mən Aşıq həya qaçdı,*
*Divana – haya qaçdı.*
*Zəmanə bəd gəlibdi,*
*Ar getdi, həya qaçdı.*
**Sarı Aşıq**

**№2(17)**
**2015**

**Bakı-2015**

**Laçın yurdu, №2(17), 2015**
**Bakı, "Bəxtiyar-4", 2015. – 96 səh.**



Hüquqi ünvan:
**Mərdanov qardaşları 98**
Əlaqə:
**Tel.: (050) 291-34-52, (070) 956-36-22, (050) 205-00-92**
**e-mail: lachinyurdu@mail.ru**

Dərgidə dərc olunan yazılar müəlliflərin mövqeyini əks etdirir
və yazı müəllifləri məsuliyyət daşıyır.
Jurnal 16.03.2010-cu il tarixdə Azərbaycan Respublikasının Ədliyyə Nazirliyində 3133 №-li reyestrlə qeydiyyatdan keçmişdir.

Bankın adı: **Azərbaycan Beynəlxalq Bankı MƏTBUAT şöbəsi**
Bankın kodu: **805142**,
Müxbir hesabı:
**AZ03NABZ01350100000000002944,**
VÖEN: **9900001881**
SWIFT: **IBAZAZ2X**,
Müştərinin hesabı:
**AZ64IBAZ41040019443136196216**
**Məmmədov Arif Kamran oğlu**
VÖEN:**1401771462**

Intermediary Bank:
**Citibank NA, New York, USA**
Corr. account: **36083186**
SWIFT: **IBAZAZ2X**,
International Bank of Azerbaijan Republic
Yasamal Branch
kod: **805142**
USD only Account #:
**AZ64IBAZ41040019443136196216**
**Mammadov Arif Kamran**
INN**: 1401771462**

# BU SAYIMIZDA

**RƏSMİ XƏBƏRLƏR**

## QAX RAYONUNDA MÜVƏQQƏTİ MƏSKUNLAŞMIŞ LAÇIN RAYON SAKİNLƏRİ İLƏ GÖRÜŞ-SƏYYAR QƏBUL KEÇİRİLMİŞDİR

24 iyun 2015-ci il tarixində Qax rayonu ərazisində müvəqqəti məskunlaşmış rayon sakinləri ilə Qax rayonunun Şıxlar kəndində görüş-səyyar qəbul keçirilmişdir.

Görüşdə dövlət başçısı tərəfindən məcburi köçkünlərə daim yüksək diqqət və qayğı göstərildiyini vurğulayan Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov ölkədə və rayonda aparılan geniş quruculuq və abadlıq işlərindən, ayrı-ayrı sahələrdə əldə edilmiş uğurlardan, məcburi köçkünlərin problemlərinin həlli, mənzil-məişət şəraitlərinin yaxşılaşdırılması istiqamətində həyata keçirilən tədbirlərdən söz açmışdır.



Görüşdə çıxış edən məcburi köçkünlər onlara göstərilən diqqət və qayğıya görə, vətəndaşlarla yerlərdə mütəmadi görüşlərin keçirilməsi ilə bağlı ölkə başçısı cənab İlham Əliyevə öz minnətdarlıqlarını bildirmiş, ölkəmizdə keçirilən Birinci Avropa Oyunlarından fəxarətlə danışmışlar.

Görüşdən sonra keçirilmiş səyyar qəbulda 7 nəfər məcburi köçkünün müraciətləri dinlənilmiş, həmin müraciətlərə baxılması üçün Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov tərəfindən yerindəcə aidiyyəti üzrə müvafiq tapşırıqlar verilmiş, verilmiş tapşırıqların icrası nəzarətə götürülmüşdür.

## DÖVLƏT QULLUQÇULARININ PEŞƏ BAYRAMI QEYD EDİLMİŞDİR

23 iyun 2015-ci il tarixində dövlət qulluqçularının peşə bayramı günü münasibətilə Laçın Rayon İcra Hakimiyyətində tədbir keçirilmişdir. Laçınlı dövlət qulluqçuları ilk öncə Laçın Rayon İcra Hakimiyyətinin qarşısındakı Ulu öndər Heydər Əliyevin büstünü ziyarət etmiş, büstün önünə gül dəstələri qoyaraq Ulu öndərə tükənməz sevgi və ehtiramlarını bildirmişlər. Sonra tədbir Rayon İcra Hakimiyyətinin inzibati binasında davam etdirilmişdir. Tədbiri giriş sözü ilə açan Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov rayonda dövlət qulluğu sahəsində işləyən bütün dövlət qulluqçularını peşə bayramı günü münasibətilə təbrik etmiş, onlara məsuliyyətli və şərəfli işlərində uğurlar arzulamışdır. Rayon rəhbəri çıxışında ölkəmizdə dövlət quruculuğu, dövlət idarəetmə sisteminin formalaşması və dövlət qulluğunun inkişafı proseslərində ümummilli lider Heydər Əliyevin misilsiz xidmətlərindən danışmış, Ulu öndər Heydər Əliyevin Azərbaycanda ikinci dəfə hakimiyyətə gəlişi ilə müasir dövlətçiliyimizin əsaslarının yaradıldığını bildirmişdir. Eyni zamanda Azərbaycanda dövlət quruculuğu və idarəçiliyi istiqamətində həyata keçirilən islahatlardan ətraflı məlumat verən Rayon İcra Hakimiyyətinin başçısı ölkə prezidenti cənab İlham Əliyevin rəhbərliyi ilə bu sahədə əldə edilən nailiyyətlərdən danışmış, respublikamızda çevik dövlət idarəetmə sisteminin formalaşdığını qeyd etmişdir. Çıxışda həmçinin ölkə başçısının dövlət qulluqçularına olan hərtərəfli diqqət və qayğısının nəticəsi olaraq 2006-cı ildən ölkəmizdə "23 iyun – Dövlət Qulluqçularının Peşə Bayramı Günü" kimi təntənəli surətdə qeyd edildiyi və bu günün hər bir dövlət qulluqçusunun həyatına ən əlamətdar hadisə kimi daxil olduğu vurğulanmışdır. Rayon İcra Hakimiyyətinin başçısı xüsusilə vurğulamışdır ki, mütəmadi olaraq ölkə prezidentinin sərəncamları ilə dövlət qulluqçularının əməyi qiymətləndirilir, onlar müxtəlif orden, medal və fəxri adlarla təltif edilirlər. Qeyd olunmuşdur ki, Azərbaycan Respublikası Prezidentinin "Dövlət qulluqçularının təltif edilməsi haqqında" 2015-ci il 22 iyun tarixli müvafiq Sərəncamı ilə Laçın Rayon İcra Hakimiyyəti başçısının Bozlu kənd inzibati ərazi dairəsi üzrə nümayəndəsi Təhməzov Hacif Minbir oğlu da uzun müddət dövlət qulluğunda səmərəli fəaliyyətinə görə "Dövlət qulluğunda fərqlənməyə görə" medalı ilə təltif olunmuşdur.

Sonda xatirə şəkli çəkdirilmişdir.

## LAÇIN RAYON İCRA HAKİMİYYƏTİ BAŞÇISI YANINDA ŞURANIN NÖVBƏTİ GENİŞ İCLASI KEÇİRİLDİ

2015-ci il 22 iyun tarixində Laçın Rayon İcra Hakimiyyəti başçısı yanında Şuranın növbəti geniş iclası keçirilmişdir. Rayon İcra Hakimiyyəti başçısı Akif Səlimovun sədrliyi ilə keçirilmiş Şura iclasında Rayon İcra Hakimiyyəti başçısı aparatının məsul işçiləri, idarə, müəssisə, təşkilat rəhbərləri, qəsəbə və kənd inzibati ərazi dairələri üzrə nümayəndəliklərin əməkdaşları daxil olmaqla 110 nəfər iştirak etmişdir. Şura iclasında "Azərbaycan Respublikası Prezidentinin 2004-cü il 1 iyul tarixli 298 nömrəli Sərəncamı ilə təsdiq edilmiş "Qaçqınların və məcburi köçkünlərin yaşayış şəraitinin yaxşılaşdırılması və məşğulluğunun artırılması üzrə Dövlət Proqramı"na 2007-ci il 31 oktyabr tarixli və 2011-ci il 21 fevral tarixli Sərəncamlarla edilmiş Əlavələrlə bağlı Laçın rayonunda görülmüş işlərin vəziyyəti" və rayonda ayrı-ayrı sahələr üzrə görülmüş işlər və qarşıda duran vəzifələr haqqında məsələlər ətraflı müzakirə edilmiş, bu sahələrdə görülən işlərdən bəhs olunaraq qarşıda duran vəzifələr müəyyənləşdirilmiş, hər bir məsələ üzrə müvafiq qərarlar qəbul edilmişdir.

İşgüzar şəraitdə keçmiş geniş Şura iclasında gündəlikdə duran məsələlər üzrə açıq müzakirələr və qarşılıqlı fikir mübadilələri aparılmış, qarşıda duran vəzifələrin vaxtında və günün tələbləri səviyyəsində həyata keçirilməsi aidiyyəti rayon təşkilatlarının əsas vəzifələrindən hesab edilmişdir.



**BİZƏ YAZIRLAR**

## "LAÇIN YURDU" JURNALININ BAŞ REDAKTORU ARİF MƏMMƏDLİYƏ

Hörmətli baş redaktor, hüquqi dövlət olaraq Azərbaycan dünya dövlətləri arasında özünün milli-mənəvi dəyərlərinin təbliği sahəsində böyük nailiyyətlər qazanmışdır. Artıq ölkəmiz müstəqil dövlət siyasəti ilə yanaşı, özünün mədəniyyəti, incəsənəti, təhsili, idmanı ilə də dünya ölkələri arasında böyük nüfuza malikdir. Coğrafi mövqeyinə görə Şərqlə Qərbin qovşağında yerləşən Azərbaycan bir müsəlman ölkəsi olsa da, dini tolerantlığı ilə seçilən ölkələrdəndir.

Son zamanlarda ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının ildönümü münasibət ilə Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin dini icmaların nümayəndələri arasında "Heydər Əliyev və milli-mənəvi dəyərlərimiz" mövzusunda məqalə müsabiqəsi keçirməsi bir ənənə halını almışdır. Bir qayda olaraq həmin müsabiqədə ölkəmizin bir çox din xadimləri və ruhaniləri iştirak edirlər. İştirakçılar tərəfindən ulu öndərimiz Heydər Əliyevin Azərbaycanın dövlət müstəqilliyinin və dövlət siyasətinin, milli-mənəvi dəyərlərimizin, dinimizin, o cümlədən dini tolerantlığımızın təbliği ön planda təqdim edilir.

Hörmətli Arif müəllim, ulu öndərimizin xatirəsinə həsr olunmuş həmin müsabiqələrdə fəal surətdə iştirak edən din xadimlərindən biri də Goranboy rayonu Səfikürd kənd məscidi dini icmasının sədri Hacı Elnur Cəfərovdur.

Hacı Elnur 2014-cü ildə Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin ulu öndər Heydər Əliyevin anadan olmasının 91 illiyi münasibəti ilə dini icmaların nümayəndələri arasında "Heydər Əliyev və milli-mənəvi dəyərlərimiz" mövzusunda təşkil etdiyi ümumrespublika məqalə müsabiqəsində fəal iştirakına görə diplomla, 2015-ci ildə isə ulu öndərin anadan olmasının 92-ci ildönümü münasibəti ilə həmin mövzuda keçirilən müsabiqədə üçüncü yer tutduğuna görə Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin Fəxri fərmanı ilə təltif edilmişdir.

Dinimizə və dini tolerantlığımıza ümummilli liderimiz Heydər Əliyevin qayğısına həsr olunmuş həmin məqaləni diqqətinizə təqdim edirəm.

**Hörmətlə: İsgəndər SƏKLİKOV,**
***Azərbaycan Respublikasının Əməkdar müəllimi***

## ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEV VƏ MÜASİR AZƏRBAYCAN DÖVLƏTİ

Hər kəs bu həyatda bir cür yaşayır və hər kəsin yerini onun əməlləri müəyyənləşdirir. "İnsan var, üzündən, insan var, izindən tanınar" – deyib atalarımız. Kim ki, izdən tanınır, onun ömrü yaşadığı günlərin sayı qədər olur. Amma izindən tanınanlar əbədi yaşamaq haqqını qazananlardır. Bunun üçün gərək xeyirxah əməllərinlə yaddaşlarda qala, insanların qəlbinə yol tapasan. Azərbaycan xalqının ümummilli lideri Heydər Əlirza oğlu Əliyev məhz belə insanlardandır. O, öz adını Azərbaycanın dövlətçilik tarixinə, xalqımızın milli təfəkkür yaddaşına qızıl hərflərlə yazdırdı. Müasir Azərbaycanın memarı, dövlətçiliyimizin xilaskarı olan ümummilli liderimiz həm dünyanın siyasət arenasında öz sözünü demiş nüfuzlu siyasət xadimi, həm də silinməz iz qoymuş tarixi şəxsiyyət kimi adını yaddaşlara həkk etdirən böyük insandır.



Heydər Əliyev elə bir tarixi şəxsiyyətdir ki, insanların bir çox ali xüsusiyyətlərini göstərən meyarlar onda cəmləşmişdir.

Dünyada Allah-taalanın razılığını, insanların sevgisini qazanmaqdan qiymətli heç nə ola bilməz. Allah o bəndəsini sevər ki, o şəxs tək özü üçün deyil – xalqı, milləti və bütün insanlar üçün, insanlıq üçün yaşasın, ömrünü fəda etsin. Heydər Əliyev də məhz belə yaşadı. O, ömrünü xalqına, dövlətinə, onun təhlükəsizliyinə, xoşbəxt gələcəyinə həsr etdi.

1969-cu ildə respublika rəhbərliyinə gələn Heydər Əliyev xalqımızın milli-mənəvi dəyərlərinə yönəlmiş təcavüzlərə son qoyulmasına, ölkənin hərtərəfli və sürətli inkişafına nail oldu. Zaman-zaman tarixin sərt sınaqları qarşısında qalan xalqımız böyük çətinliklərlə üzləşərək çox itkilər vermiş, lakin mənəviyyatını qorumağı bacarmışdır. Heydər Əliyev isə mənəviyyatı ilə birgə bu xalqın özünü təhlükədən xilas etdi.

Cənubi Qafqaza köçürüldükləri gündən torpaqlarımızı işğal edən, soydaşlarımızı kütləvi şəkildə qətlə yetirən ermənilər çirkin əməllərini imperiyanın dəstəyi ilə daha sərt şəkildə həyata keçirməyə çalışırdılar. Məhz sovet dönəmində Zəngəzuru itirdik, azərbaycanlılar Qərbi Azərbaycandan deportasiya edildilər. Açıq-aşkar soyqırımı və etnik təmizləmə siyasəti yürüdən erməni və onların havadarlarının insanlıqdan uzaq hərəkətlərinə nəinki göz yumur, hətta bu mənfur siyasətin genişlənməsinə təkan verirdilər. Lakin Heydər Əliyev respublikamıza rəhbərliyə gəldikdən sonra nəinki ermənilərin, hətta onların havadarlarının da çirkin siyasətinə son qoyuldu. Ümummilli liderin polad iradəsi, qətiyyəti və xalqına, Vətəninə olan tükənməz sevgisi qarşısında həmin şər qüvvələr aciz qaldılar. Azərbaycan qısa müddət ərzində sürətlə inkişaf etdi, özünün yeni intibah dövrünə qədəm qoydu. Heydər Əliyevin Azərbaycanın müstəqilliyinə hesablanmış siyasəti öz bəhrəsini 1991-ci ildə verdi. Məhz Azərbaycanın dövlət müstəqilliyinin qazanılması, bu əvəzsiz tarixi nailiyyətin qorunaraq daha da möhkəmləndirilməsi, ölkə vətəndaşlarının həyat şəraitinin arzulanan səviyyəyə yüksəldilməsi, dövlət təhlükəsizliyinin tam təmin olunması ümummilli liderimizin adı və xidmətləri ilə bağlıdır.

Azərbaycan xalqı 1991-ci ildə öz müstəqilliyini elan etsə də, o vaxtkı hakimiyyət bu müstəqilliyi qorumaq, dövlətçiliyimizin təhlükəsizliyini təmin etmək və ölkədə baş verən ictimai-siyasi proseslərə nəzarət etmək iqtidarında deyildi. Yenicə öz müstəqilliyinə qovuşan Azərbaycan dünyanın dövlətçilik tarixindən silinmək təhlükəsi qarşısında idi. Ancaq soydaşlarımın, igid oğul və qızlarımızın qanı bahasına əldə olunmuş bu müstəqilli-

yi saxlamaq üçün xalqımız nicat yolu axtarırdı. Hamının diqqəti və ümidi uzun illər respublikamıza rəhbərlik etmiş, xalqına və dövlətinə vicdanla xidmət göstərmiş və ümumittifaq arenada özünü güclü lider və ictimai-siyasi xadim kimi təsdiqləmiş Heydər Əliyevə yönəlmişdi. Çünki, xalqımızı və dövlətçiliyimizi çətin şəraitdən, uçurumdan yalnız Heydər Əliyev qətiyyəti, iradəsi, liderlik və siyasi manevrlik bacarığı xilas edə bilərdi. Zəngin dövlətçilik, yüksək rəhbərlik və təşkilatçılıq təcrübəsinə malik olan Heydər Əliyev ölkədə qısa müddət ərzində davamlı sabitliyə nail oldu, respublikamızın hərtərəfli inkişaf strategiyasını müəyyənləşdirdi, torpaqlarımızın işğalçılıq prosesinə son qoyaraq uzunmüddətli atəşkəs razılaşmasını reallaşdırdı və ən əsası Azərbaycan həqiqətlərini nüfuzlu beynəlxalq təşkilatların ali tribunalarından bütün dünyaya bəyan etdi.

Tarixi torpaqlarımızı işğal edən Ermənistan dünyaya təcavüzkar və işğalçı kimi tanıdıldı. Məhz bu görkəmli şəxsiyyətin uğurlu düşünülmüş daxili və xarici siyasəti nəticəsində Azərbaycanla çoxşaxəli əlaqələr qurmaq istəyən ölkələrin sayı günü-gündən artırdı. Daxili sabitliyin təmin olunması ölkədə müxtəlif sahələrin inkişafına qoyulan sərmayələrin sürətli artmasına səbəb oldu. Bununla da Azərbaycan dünyada etibarlı tərəfdaş, insan hüquq və azadlıqlarının qorunduğu, vətəndaşların təhlükəsizliyinin təmin edildiyi, milli və dini ayrı-seçkiliyin baş vermədiyi ölkə kimi tanınmağa başladı. Ən başlıcası isə Heydər Əliyev Azərbaycana əsrlər boyu nailiyyətlər qazandıracaq siyasi kursu müəyyənləşdirdı.

Ərazilərinin 20 faizinin işğal altında qaldığı, milyondan çox vətəndaşının didərginlik yaşadığı, zəngin təbii sərvətlərinə, strateji mövqeyinə görə əksər dünya dövlətlərinin siyasi-iqtisadi maraqlarının toqquşduğu bir ölkədə sabitlik yaratmaq, vətəndaşlarının sosial rifahını yaxşılaşdırmaq, gələcək uğurların əsasını qoymaq cəsarət, qətiyyət, yüksək bilik və bacarıq tələb edirdi ki, bütün bu keyfiyyətləri özündə məhz Heydər Əliyev birləşdirmişdi.

Sosial-iqtisadi inkişafın təməli isə əsrin kontraktı adlandırılan neft sazişi ilə reallaşdı. Ümummilli lider həmin müqavilə ilə həm də ölkəmizin siyasi və hərbi toxunulmazlığını rəsmən təmin etmiş oldu. Hər bir ölkənin, şəhərin, kəndin inkişafı onun əhalisinin yaşayış səviyyəsi ilə ölçülür. Heydər Əliyev həmişə respublika vətəndaşlarının taleyini düşünür, onların maddi-sosial rifahının yüksəlməsi üçün zəruri işlər görürdü. Azərbaycanın sürətli, hərtərəfli inkişafını təmin edən proqramlar hazırlayan, çoxsaylı fərman və sərəncamlar imzalayan ümummilli liderimiz verdiyi qərarların icra vəziyyəti ilə şəxsən özü maraqlanırdı. Respublikamızın hər bir bölgəsində olan

Heydər Əliyev zəhmetkeşlərlə görüşür, onların problemlərinin həll edilməsi üçün aidiyyəti orqanlara müvafiq tapşırıqlar verirdi.

Heydər Əliyev neft strategiyasının inkişafını təkcə neft sektoru ilə məhdudlaşdırmağın qəti əleyhinə idi. O, qəti şəkildə vurğulayırdı ki, ölkənin inkişafını təkcə neftdən gələn gəlirlər hesabına deyil, başqa sahələrin inkişaf etdirilməsi ilə təmin etmək lazımdır. Eyni zamanda neft gəlirləri hesabına funksional savadlı insan potensialının inkişaf etdirilməsini, layiqli kadr hazırlığının təmin edilməsini önə çəkən ümummilli liderimiz bu sahəni daim diqqət mərkəzində saxlamağı üstün tuturdu. Bütün bunları reallaşdırmaq üçün ölkədə möhkəm hüquqi baza formalaşdırıldı. Görülən bu işlər istər ümummilli liderin həyat və fəaliyyətinin əsasını təşkil etməklə yanaşı, bütün varlığı ilə Azərbaycana nə qədər bağlı olduğunu göstərdi.




Dövlət quruculuğundan tutmuş sosial-iqtisadi inkişafın təmin olunması, ordu quruculuğu, elm və mədəniyyətin inkişafı, regional tikinti-quruculuq işlərinin aparılması, milli-mənəvi dəyərlərimizin qorunması və gələcək nəsillərə çatdırılmasınadək olan bütün məsələlərdə Heydər Əliyevin dəstxəti, izi var. Qısa müddət ərzində nizamlı ordu quruculuğunun, daxili sabitliyin yaradılması, idarəetmədə layiqli kadrların yer alması digər sahələrin inkişafını da stimullaşdıran amilə çevrildi.

Yəqin ki, "Lissabon sammiti" hər kəsin yaxşı yadındadır. Həmin sammitdə iştirak edən 53 dövlətdən 52-si Azərbaycanı dəstəkləyərək Ermənistanı təcavüzkar, işğalçı dövlət kimi tanıdı. Eyni zamanda həmin sammitdə qəbul olunmuş bəyənnamədə Ermənistan ordusunun işğal etdiyi Azərbaycan torpaqlarından geri çəkilməsi, Azərbaycanın ərazi bütövlüyünün tanınması göstərilmişdir. Bu kimi nailiyyətlərin sayı kifayət qədərdir və birbaşa Heydər Əliyevin adı ilə bağlıdır. Heydər Əliyev layiq olduğu zirvəyə ucaldı və Azərbaycanı da ucaltdı. İndi dünyanın hər yerində Azərbaycan deyəndə – Heydər Əliyev, Heydər Əliyev deyəndə – Azərbaycan yada düşür. Ümummilli liderimizin uzaqgörən siyasətinin bir

bariz nümunəsi də ölkədə milli və dini ayrı-seçkiliyə yol verilməməsi, əsl şəffaf – demokratik tolerant mühitin formalaşdırılması idi.

Ölkəmizdə bir neçə millətin nümayəndəsi yaşasa da, "Vahid Azərbaycan xalqı" məfhumunun formalaşması, azərbaycançılıq ideologiyasının təbliği və gələcək nəsillərə ötürülməsi məhz ümummilli liderimizin düşünülmüş siyasətidir. Həmçinin bir neçə dinə etiqad edən insanların və qurumların bir ölkədə, eyni ədalət prinsipi altında, sülh-əminamanlıq və qarşılıqlı hörmət şəraitində yaşaması da vaxtı ilə Heydər Əliyevin yaratmış olduğu düşünülmüş siyasi istiqamətin düzgün nəticəsi, ürəkaçan mənzərəsidir.

Bu siyasi yol, həm də bütün dünyanın indi etalon kimi qəbul etdiyi və Azərbaycanı özləri üçün təbliğat və dəyər formulu kimi qəbul etdiyi ən düzgün yoldur. Ümummilli liderimiz cismən aramızda olmasa da, onun irsi və ideologiyası bu gün də yaşayır və dövlətçilik ənənələrimiz, idarəçilik prinsiplərimiz onun müəyyən etdiyi strategiya üzrə inkişaf etdirilir.

Bu gün beynəlxalq qurumların, ictimai-siyasi təşkilatların, dövlət başçılarının, rəsmi şəxslərin, dini liderlərin ölkəmizdə tez-tez olmaları, beynəlxalq tədbirlərin keçirilməsi, seminar və konfransların təşkil olunması həm ölkəmizin dünya miqyasında tolerant dövlət kimi tanınmasının, siyasi nüfuz sahibi olmasının, həm də daxili sabitlik, inkişafın əsaslı və davamlı olmasının ən gözəl sübutudur. Ömrünün son anlarına qədər xalqını, Vətənini düşünən ümummilli liderimiz qarşısına qoyduğu bütün məqsədlərə nail oldu. O heç vaxt başladığı işi yarıda qoymadı. General Cəmşid Naxçıvanski adına Hərbi Məktəbin müdavimləri qarşısında çıxışı zamanı səhhətinin pisləşməsi ilə bağlı müvazinətini itirsə də, nitqini axıra kimi çatdırmaq üçün bir daha tribunaya döndü və nitqini bitirdi. Bəli, o əsl Ali Baş Komandan idi, cəsarət, qətiyyət və iradə simvolu idi.

"Mən gələcək nəsillərə çox güclü, qüdrətli və iqtisadi cəhətdən inkişaf etmiş Azərbaycan qoyub getmək istəyirəm", – dedi Heydər Əliyev. Dedi və etdi. Ancaq özü getmədi. Özünün qurub yaratdığı müasir, müstəqil Azərbaycanla birgə yaşadı. O, xalqımız üçün, dövlətimiz üçün, hüquqi baza və ali qanun toplusu olan və hər bir xalqın, dövlətin mövcud olmasında əsas rol oynayan konstitusiya aktının müəllifi kimi də müasir tariximizə öz adını qızıl hərflərlə yazdıran dövlət başçısı oldu. Məhz onun yaratdığı konstitusiya əsasında dövlətimizin digər qanunvericilik topluları və aktları formalaşdırıldı.

Ümummilli liderimiz Heydər Əliyevin Azərbaycan üçün xidmətlərini 5-6 vərəqdə qeyd etmək mümkünsüzdür. Onun haqqında cild-cild kitablar yazılıb, dünyanın görkəmli şəxsiyyətləri, ictimai-siyasi xadimləri, dövlət

adamları, elm, mədəniyyət nümayəndələri dəyərli fikirlər söyləyib və söyləməkdədir. Ancaq ən böyük görünən və qəbul edilən həqiqət isə Müasir Azərbaycanın Heydər Əliyevin adı ilə bağlı olmasıdır. Bu dövləti özü qurdu və özü də onunla birgə yaşamaq xoşbəxtliyini qazandı.

Ümummilli liderimiz müasir Azərbaycanla birgə xalqımıza irs qoyub getdiyi daha iki böyük amil, iki böyük sərvət də var:

– Biri – azərbaycançılıq ideologiyası,

– Biri isə Azərbaycan dövlətinin qarantı, Heydər Əliyev ideologiyasının və irsinin yaradıcısı İlham Əliyev.

Qətiyyətlə və əminliklə deyə bilərik ki, bu gün dövlətimiz və xalqımız əmin əllərdədir. Onun layiqli davamçısı olan Prezidentimiz və Ali Baş Komandanımız cənab İlham Əliyev ümummilli liderimizin dövlətçilik irsinə və siyasi ideologiyasına sadiq qalaraq müasir Azərbaycanı uğurlu gələcəyə, davamlı inkişafa aparır. Məhz İlham Əliyevin birgə fəaliyyətinin nəticəsidir ki, Azərbaycan regionun əsas söz sahibi kimi beynəlxalq arenada özünə layiq yerdə olmaqla, öz milli-mənəvi dəyərlərini qorumaq və yaşatmaq prinsiplərini əsas tutaraq dünyaya inteqrasiya olunur, inkişaf edir.

İndi artıq Azərbaycan qloballaşan dünyada öz iqtisadi inkişaf tempi ilə seçilən yeni lider dövlət kimi formalaşmaqdadır. Gündən-günə artan iqtisadi və siyasi qüdrətimiz ölkədaxili nailiyyətlərin, inkişafın əldə olunması ilə yanaşı, dövlətimiz və xalqımız üçün əsas problem olan Dağlıq Qarabağ münaqişəsinin də tezliklə Azərbaycanın xeyrinə həll olunmasını reallaşdırmaqdadır.

Avropa və dünya miqyaslı layihələrin Azərbaycanda gerçəkləşməsi, ölkəmizin bir çox uğurlara imza atması dövlətimizin gücünün də artmasına zəmin yaradır.



Bütün bunlar siyasi ideologiyanın Prezident İlham Əliyev və onun ailəsi tərəfindən uğurla yaşadılmasının, həyata keçirilməsinin təntənəsidir.

**Hacı Elnur CƏFƏROV,**
***Goranboy rayonunun Səfikürd kənd məscidi dini icmasının sədri***

MÜSAHİBƏ

# "LAÇINLILARI LAÇINA QAYTARMAQ ÜÇÜN GƏLMİŞƏM"



***Laçın Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov lacin.info saytının suallarını cavablandırıb. Həmin müsahibəni oxuculara təqdim edirik.***

**– Akif müəllim, təyin olunmağınızdan üç il keçir, yorulmamısınız ki?**
– Elə bilirəm ki, bu gün təyin olunmuşam **(gülür)**.

**– Tez-tez səyyar görüşlər keçirdirsiniz. Rayon sakinləri daha çox nədən narazılıq edir?**
– Bizim rayonun əhalisinin narazı olduğu əsas məsələ məcburi köçkünlüyün yaratdığı problemlərdir. Bunları ümumiləşdirsək adına məişət problemləri demək olar. Yəni, hələ ki bütün qaçqınlar evlə təmin olunmayıb, amma bütövlükdə əhalinin dövlət səviyyəsində elə bir problemi yoxdur. Sakinlərimiz dövlətimizdən də, Cənab Prezidentdən də, qaçqınlara olan qayğıdan da razıdırlar. Ona görə də elə ciddi narazılıqlar yoxdur.

**– Hazırda rayonda hərbi vətənpərvərlik ruhu necədir?**

– Tam əminliklə deyə bilərəm ki, bu gün hərbi vətənpərvərlik ruhu Laçın rayonunda çox yüksək səviyyədədir. Bilirsiniz ki, 2013-cü ildə Laçın Rayon İcra Hakimiyyətinin təşəbbüsü ilə bu məsələlər ölkə səviyyəsində araşdırıldı. Belə qərara gəlindi ki, gənclərin hərbi akademiyalara qəbulu məsələsi ilə birbaşa icra hakimiyyəti başçıları ciddi məşğul olsunlar. Bu da zərurətdən atılmış addımdır. Araşdırmalar göstərir ki, məcburi köçkün düşən rayonların sakinlərindən hərbi akademiyaya qəbul olanların sayı 2013-cü ilə nisbətən 2014-cü ildə 10 dəfəyə yaxın artıb. Laçın rayonundan isə 2013-cü ildə 4 nəfər qəbul olunmuşdusa, 2014-cü ildə onların sayı 14 nəfər olub. Bu rəqəmlər Hərbi Akademiyaya qəbul olanlara aiddir, liseylər və digər məktəblər bura aid deyil. Hərbi vətənpərvərlik quru termin deyil, bu, Azərbaycan üçün vacib bir işdir və bütün bu təşəbbüslər ona xidmət edir.

**– Laçının işğalından bizi 23 il ayırır...**

– Laçının, eləcə də Qarabağın işğalına, başımıza gələn bütün hadisələrə tarixi nöqteyi-nəzərdən yanaşmalıyıq. Çünki bu cür hadisələr hər bir xalqın başına gələ bilər. Məsələn, yəhudiləri Fələstindən qovdular. 2 min il bu xalq dünyanı gəzdi, 2 min il öz dövlətlərini qurmaq arzusu ilə yaşadı. Sonda isə 1948-ci ildə istəklərinə nail oldular. Laçının işğalından bizi 23 illik bir zaman kəsiyi ayırır. Əslində 23 ilə tarixin gözü ilə baxsaq çox da uzun zaman deyil. Belə götürəndə əsrin 1/4-dir. Ancaq buna emosional yanaşanda, fərd kimi yanaşanda, laçınlı kimi yanaşanda ağrıdır bizi. Yer qalıb, yurd qalıb, ocaq qalıb, məzarlarımız qalıb. Bunlar emosional bir hissdir. Hazırda dünyada böyük gücə malik olan dövlətlərin hamısının tarixinə məğlubiyyət yazılıb və vaxtı çatanda onlar bu məğlubiyyətin altından çıxıblar. 23 il qabaq bu hadisə bizim də başımıza gəlib. Bunlar mənim 1992-ci ildə fikirləşdiklərim idi, elə indi də o fikirdəyəm. Hamımıza gün kimi aydındır ki, biz mütləq Laçına qayıdacağıq. Sadəcə olaraq üstümüzə düşən bir vəzifə var. Dövlətimizlə bir olmaq, Cənab Prezidentin ətrafında birləşmək, qisası qiyamətə qoymamaq.

**– İstefada olan polis polkovniki, hazırkı icra başçısı, bir də yaradıcı Akif Səlimov. Hansı daha səmimidir?**

– Bir az qəliz sual oldu **(gülür).** Əslində belə götürəndə bu üç şəxsin arasında bir zərrə belə fərq yoxdur. Bu üç insanın kökündə haqq-ədalət, humanistlik durur. Bu dünən də var idi, bu gün də var, sabah da olacaq.

**– Bir neçə kitabın, çoxlu sayda məqalələrin müəllifisiniz, yazmaq həvəsi haradan yarandı?**

– Laçında normal orta təhsil alan hər bir şəxsin içində beş Laçın boyda dünya var. Beş laçınlıdan üçü şeir yazmaq qabiliyyətinə malikdir. Bu, ümumilikdə laçınlılara xas olan bir xüsusiyyətdir. 4-cü sinifdən bu günə qədər şeir yazıram. Çox sayda şeirlərim var. Hərdən başqa şeirlərə baxanda görürəm ki, mənim şeirlərim onlardan daha yaxşıdır. Ancaq bilirsən mən onları niyə üzə çıxartmamışam? İnsan bir şeyi edəndə gərək başqasından bir az fərqli edə. Bu kitabların hansı zərurətdən yarandığını deyim. Bir dəfə televiziyaların birində Laçının işğalının ildönümü ilə əlaqədar verilişə baxırdım. Bir laçınlı Laçın hadisələrini başladı öz bildiyi kimi danışmağa, təqdim etməyə. Fikirləşdim ki, bu hadisələri məndən yaxşı bilən yoxdur. Ancaq bəzi insanlar çıxıb efirdə bildiklərini də, bilmədiklərini də danışırlar. Düşündüm ki, mənim haqqım yoxdur bunu yazmamağa. Çünki mən Laçında baş verən bütün proseslərin içində olmuşam. Arxivlərdəki sənədlərlə tanış olmuşam. Belə qənaətə gəlmişəm ki, bunları yazmaq lazımdır. Çünki Laçına qayıdandan sonra naşı adamlar bu hadisələri özləri istədiyi kimi təhrif edəcəklər. Biz uzun müddət erməniyə söymək, söyə-söyə yaşamaq xülyası ilə durmuşuq. Sonra gördük ki, bu çox məkrli düşməndir. Söyməklə iş aşmır. Düşmənlə mübarizə aparmaq üçün gərək onu tanıyasan. Tanımaq üçün də düşmənin dilini, məişətini, tarixini, mədəniyyətini öyrənməlisən. Mənim Türkiyə elm adamları ilə çox yaxın əlaqələrim var. Təqaüddə olanda arxivlərdə araşdırmalar apardım, müxtəlif mənbələri öyrəndim. Nəticədə **“Cığırlar birləşsələr”** kitabını yazdım. Daha sonra **“Ora vətəndir”** kitabı ərsəyə gəldi. Baxmayaraq ki, ilk dəfəydi kitab yazırdım, ancaq bu kitablarda elə məlumatlar var ki, bu gün Azərbaycan mətbuatında rast gələ bilməzsən o məlumatlara. Bunların bir hissəsi qondarma erməni soyqırımı ilə bağlı arxivlərdən çıxmış materiallardır.

**– Bugünkü laçınlı gənclərdən razısınızmı?**

– Bugünkü Laçın gəncliyi 23 il bundan qabaqkı Laçın gəncliyindən çox fərqlənir. 23 il əvvəlki Laçın gəncliyi sovet ideologiyası ilə tərbiyə olunmuş, təmiz qalmış gənclik idi. İndiki gənclik respublikanın 58 rayonuna səpələnib, müxtəlif mühitdə böyüyüb. Razı qaldığım nədir? Bu, mənim adi vətəndaş kimi fikrimdir, icra başçısı kimi yox. Bu gün Laçın gəncliyində yüksək ali təhsil almağa doğru xeyli irəliləyiş var. İkinci məsələ 10 laçınlı gəncdən 9-nun vətənpərvər olmasıdır. Üçüncü ən böyük amil laçınlı gənclərin hamısının müharibəyə qatılmaq, vətəni azad etmək arzusudur. Sevinirəm ki, müasir Laçın gəncləri belə böyüyür. Ancaq narazı qaldığım tərəf də

var. Bəzi Laçın gəncləri çiynində Laçın boyda vətən dərdini gəzdirə-gəzdirə dini radikalizmə ayaq basırsa, dövlətimizin yaxşılığını istəməyən radikal müxalifətə simpatiyası olursa, rayon miqyasında, respublika miqyasında görülən işləri görmürsə, bu yaxşı hal deyil. Təbii ki, bu adamlar laçınlı gənclərin 1/100-ni təşkil edir. Hesab edirəm ki, bu gün Laçın rayonunda özgə dəyirmanına su tökən 1 nəfər belə olmamalıdır. Bunu bizə din bağışlayar, valideyn bağışlayar, dostlar bağışlayar, ancaq Laçın bağışlamaz!

**– Valideyn kimi övladlarınızla münasibətiniz necədir?**

– İki oğlum var. İkisi də böyüyüblər, müxtəlif vəzifələrdə çalışırlar. Övladlarımla aramızda həmişə bir səmimiyyət olub. Buna dostluq deməzdim, haradasa yoldaşlıqla dostluğun arasında bir yer var, bax münasibətimiz elədir.

**– Təqaüdə çıxanda yaradıcılığı davam etdirmək istəyirsinizmi?**

– İnşallah təqaüdə çıxdıqdan sonra yaradıcılığı davam etdirmək fikrindəyəm. Yazacağım kitabın təxminən mövzusu da hazırdır. **"Laçından kənarda gördüyüm Laçın"**. Bax bu mövzuda bir kitab yazmaq istəyirəm. Ancaq iki kitabım da çapa hazırdır. Onlardan biri **"Altaydan başlanan yol"** adlanır. Sadəcə ona görə çap etdirmirəm ki, bəzi adamlar fikirləşər ki, hazırda icra başçısıdır. Kiməsə xahiş eləyib, yazıblar.

**– Bildiyimə görə "Paşa bəyin el deyimləri" adlı kitab hazırlanır...**

– Artıq **"Paşa bəyin el deyimləri"** kitabı hazırlanmaq üzrədir. Materialların yığımı ilə məşğuluq. Bilirsiniz ki, bu el deyimlərinin bir hissəsi itib-batıb. Ancaq düşünürəm ki, bu el deyimləri mütləq mənada çap olunmalıdır. Heç olmasa çap olunub laçınlılara paylanmalıdır. Məni həmişə Laçın miqyasında bir neçə məsələ ağrıdıb. Birincisi, laçınlıların fəxr etməli olduğu **Sarı Aşığın** irsi lazımi səviyyədə öyrənilərək öz dəyərli qiymətini almayıb. İkincisi, **Seyid Mir Həmzə Nigarinin** irsi. Nigari ilə bütün türk dünyası fəxr eləyir, ancaq laçınlılar çox az tanıyır onu. Bir də Paşa bəy və onun nəslinin atalar sözünə bərabər olan el deyimləri. Bu istiqamətdə də yəqin ki, lazımi işlər görəcəyik. Biz artıq icra hakimiyyətində komissiya yaratmışıq, elm adamları, ağsaqqallar, Paşa bəyin nəslindən olan adamlarla söhbətlər aparılır. İnşallah tezliklə nəticələr olacaq.

**– Bu yaşda vəzifəyə niyə qayıtdınız?**

– Bu sualı mənə dostlar da veriblər. Tək bir cavabım var: Mən bu vəzifəyə Cənab Prezidentin rəhbərliyi altında laçınlıları Laçına qaytarmaq üçün gəlmişəm.

**Siyavuş ƏMİRLİ**

ANIM

## YANIQLI VƏ CAZİBƏLİ SƏS



Hər bir insan bu dünyada öz əməlləri, arzuları və vicdanı ilə yaşayır. İnsanların kimisi bu dünyada hamıya yaxşılıq edir, insanlara öz əlini uzadır, onların dərdlərinə şərik olur, onları yaşamağa ruhlandırır. Elə insanlar da var ki, onlar ancaq özlərini düşünür, mənəm-mənəmlik edir, heç bir kəsə yaxşılıq etmir, əksinə onları uçuruma atır. Ancaq bəllidir ki, insan dünyasını dəyişdikdən sonra onun bu dünyada əməlləri qalır, hamı ona ya rəhmət oxuyur, ya da lənət.

Məhəbbət Kazımov da bu dünyada rəhmət qazanan insanlardan oldu. O, ömrü boyu kişi kimi yaşadı, kişi kimi də köçdü bu fani dünyadan... Təmənnasız olaraq sənət dostlarından bacardığı yardımı əsirgəmədi. Öz ömrünü Vətən yolunda, xalq yolunda, Laçın yolunda şam kimi əritdi.

Erməni daşnakları tərəfindən işğal olunmuş Laçın rayonu onun ürəyinin qubar bağlamış yeri idi; bir dəqiqə, bir saniyə də olsun Laçın onun yadından çıxmadı. Onun bütün mahnılarında vətən həsrəti, vətən yanğısı duyulurdu. Məhəbbət Kazımov "Laçınım" mahnısını ifa edərkən sanki ruhən o dağlara, o düzlərə, o çaylara gedib çıxırdı. O, bu mahnını ifa edərkən sanki, ürəyi, qəlbi ilə haray çəkirdi, bu harayı hər bir kəsin eşitməsini istəyirdi.

Azərbaycan musiqi sənətinin inkişafında özünün dəstxəti olmuş Məhəbbət Kazımov nəinki respublikamızda, hətta ölkəmizdən kənarda da sevilən və arzuolunan sənətkar olmuşdur. Oxuduğu gözəl mahnıları ilə bütün insanların ürəyini fəth etmiş və onlara yeni səs, yeni nəfəs vermiş, ruhlarını oxşamışdır.

Məhəbbət Kazımov gözəl müğənni və xanəndə idi. İstər xalq mahnıları olsun, istər bəstəkar mahnıları; onları elə yapışıqlı oxuyurdu ki, sanki həmin mahnılar quş kimi qanad açıb uçurdular. Hətta ulu muğamlarımızı öz səsi ilə bir daha yaşatmış və onları Azərbaycan mədəniyyətinə bir daha təqdim etmişdir.

Məhəbbətin mahnıları gur dağ şəlaləsini xatırladırdı; onun ifaları elə bil insanların ürəyinə, beyninə hakim kəsilirdi. Bu mahnılar qayalara, daşlara çırpılaraq nur damcıları kimi onların qəlbinə, ruhuna bir sərinlik, rahatlıq gətirirdi.

Onun "Dur gedək", "Xarıbülbül", "İlk məhəbbətim", "Laçınım", "Əlvida", "Bu il yenə gedəmmədik", "Qayıt dedim", "İndən belə o gözlərə baxmaram" kimi mahnıları insanları haralara aparmır. Öz isti yurd-yuvalarından didərgin düşüb, iyirmi üç il öz Vətənlərində vətənsiz yaşayan laçınlıları ulu dədə-baba yurdlarına səsləyirdi sanki; yaz açılanda yaşıllaşan, kolların diblərində boyunlarını bükən bənövşə, nərgiz, novruzgülü topladığı vaxtlara, yayda dağlardan topladıqları qırxbuğum, əvəlik, kəklikotu, qantəpər, solmazçiçəyi yığa-yığa ətrindən doymadıqları gözəl yaylaqlara pərvaz edir elə bil. Payız olanda, dağdan enəndə atların kişnərtisi, mal-qaranın mələşməsi, itlərin hürüşməsi, çobanların bir-birini haylaması – bütün yaşananlar bir kino lenti kimi insanların gözlərinin önündən keçir.

Biz Məhəbbət müəllimin yoxluğunun acısını hər gün daha çox hiss edirik. Bu həqiqət nə qədər acı, nə qədər çətin olsa da, biz onunla barışmaq məcburiyyətindəyik. Onun həm sevgi, həm də həsrət dolu səsinin, nəfəsinin ecazını yadigar qalan əvəzsiz nəğmələri yaşadacaq!

Məhəbbət müəllim həmçinin çox zarafatcıl və baməzə bir insan idi. O uzaq yol gedərkən, öz yoldaşları ilə söhbət edərkən tez-tez zarafatlar edər və onları güldürərdi. Bir gün Məhəbbət müəllim "Ümid var " verilişində aparıcı Zaur Baxşəliyevə verdiyi cavab da bunu sübut edir: "Çay-çörəyimi verən olsa, yıxılı bir evin dirəyiyəm". Bu sözlər bütün zalda oturanların gülüşünə səbəb oldu. Hamı onun sözlərini alqışladı və ona cansağlığı arzuladı.

O, hətta ölümdən də qorxmurdu. Həmişə deyirdi ki, "... insan kişi kimi yaşamalı, kişi kimi də ölməlidir. Mənim kimi insanların ölməyinin eybi yoxdur, təki Azərbaycan xalqı, Azərbaycan dövləti, Azərbaycan bayrağı yaşasın". Bütün fərqli cəhətləri ilə Tanrı nurundan pay almış bu cazibəli səs sahibi bu həyatda ləyaqətlə yaşadı, ad-san, insanlıq, məğrurluq, cəsarət, qeyrət nümunəsi olan ömrünü şərəflə başa vurub qəlblərdə əbədiyaşarlıq qazandı.



**Məlahət AĞAYEVA,**
***sənətşünaslıq üzrə fəlsəfə doktoru***

## İŞİMİZİ GÜNÜN TƏLƏBLƏRİ SƏVİYYƏSİNDƏ QURURUQ



Laçın Rayon Mədəniyyət və Turizm Şöbəsinin tabeliyində olan təşkilatlar respublikamızın 23 inzibati rayonunda fəaliyyət göstərir. 1992-ci il may ayının 18-dən bu rayon məcburi köçkünlük həyatı yaşayır. Hazırda Rayon Mədəniyyət və Turizm Şöbəsinin nəzdində 5 uşaq musiqi məktəbi, 1 rayon mədəniyyət evi, 3 şəhər klubu, 1 MKS və onun 107 filialı, 2 şəhər kitabxanası, 1 dövlət rəsm qalereyası, 1 tarix-diyarşünaslıq muzeyi, Sarı Aşıq muzeyi, tarixi abidələr üzrə mühafizəçilər, kənd icra nümayəndəliyi tərəfindən maliyyələşdirilən 45 kənd klubu, 33 kənd mədəniyyət evi fəaliyyət göstərir.

Laçın Rayon Mədəniyyət və Turizm Şöbəsinin müdiri Yusif Hüseynov söhbət zamanı bildirdi ki, iş planına uyğun olaraq şöbənin tabeliyində olan müəssisələr cari ildə ayrı-ayrı inzibati ərazilərdə yerləşməsinə baxmayaraq öz davamiyyətlərini, keçirdikləri tədbirlərin müntəzəmliyi baxımından şöbənin göstərişini nəzərə alaraq həyata keçirirlər. Klub müəssisələri və kitabxanalara əməli-metodiki göstəriş vaxtlı-vaxtında verilir. Bu məqsədlə şöbənin inspektor və metodisti daim yerlərdə olur. Müəssisələrdə aparılan əməli metodiki vəziyyətlə tanışlığın nəticəsidir ki, mədəni-maarif müəssisələri texniki və əyani təşviqat vasitələrilə təmin olunmuş nazirlik tərəfindən əməli-metodiki köməkliklər göstərilmişdir.

Həmçinin, uşaq musiqi məktəblərində tədris edilən ixtisasların tədris proqramları üzrə düzgün təşkili və tətbiqi bir məqsəd kimi qarşıya qoyulmuşdur. Elə bu məqsədlərə, hər il olduğu kimi, hesabat dövründə də nazirlik tərəfindən xüsusi bölgü əsasında ayrılmış tədris vəsaitləri, təlimati sənədlər toplusu, musiqi ədəbiyyatları və proqramları məktəblərə çatdırılmış və şöbə rəhbərliyi tərəfindən təlim və tədris prosesinin təkmilləşdirilməsi istiqamətində məktəb direktorlarına müntəzəm olaraq tövsiyələr verilmişdir. Bu məqsədlə şöbə tərəfindən xüsusi tədbirlər planı hazırlanmışdır. 2014-2015-ci tədris ilində məktəb binalarının qış-yaz mövsümündə fəaliyyəti, istilik, bina vəziyyəti, uşaq qəbulu və sair məsələlər nəzərdə tutulduğu kimi həyata keçirilmişdir.

MKS (Mərkəzləşdirilmiş Kitabxana Sistemi) və onun filialları illik plana uyğun olaraq müxtəlif mədəni-kütləvi tədbirlər, yaradıcılıq və oxucu ge-

cələri, konfransları, kitab sərgiləri, tematik gecələr, biblioqrafik icmallar, şair və yazıçıların yubileyləri və digər tədbirlər həyata keçirmişdir.

Y.Hüseynov daha sonra qeyd etdi ki, şöbə rəhbərliyi tərəfindən rayon mədəniyyət evi, muzeylər, kənd mədəniyyət evləri və klubları, rəsm qalereyasının da işində nəzərəçarpacaq dərəcədə dönüş olmuşdur.

Rayon İcra Hakimiyyətinin dəstəyi ilə keçirilən bütün tədbirlərin bədii hissəsi mədəniyyət işçilərinin iştirakı ilə yekunlaşmışdır.

Ağcabədi rayonunun Taxtakörpü deyilən ərazisində, qış obalarında, rayon sakinlərinin sıx yaşadığı rayonlarda daim konsertlər təşkil edilmişdir.

20 Yanvar şəhidlərinin xatirəsinə həsr olunmuş “20 Yanvar – müstəqilliyə aparan yol”, “Xalqın qan yaddaşı”, “Ağı deyən qərənfil”, “Şəhidlərimiz and yerimizdir”, “Qisas qiyamətə qalmaz” və sair xatirə və yadetmə mərasim kompozisiyaları təşkil edilmişdir. Rayon mədəniyyət evi və rəsm qalereyasının Bakı şəhəri Nizami rayonunda yerləşən Laçın rayon 33 saylı məktəbdə təşkil etdiyi “20 Yanvar – müstəqilliyə aparan yol” adlı kompozisiya dinləyicilərin, ələlxüsus məktəblilərin marağına səbəb olmuşdur.

Ağcabədi rayonunun Taxtakörpü adlanan qəsəbəsində Rayon İcra Hakimiyyətinin dəstəyi ilə xatirə kompleksinin qarşısında keçirilən 20 Yanvar şəhidlərinə həsr olunmuş kompozisiya tamaşaçılar tərəfindən rəğbətlə qarşılanmışdır. Burada Xocalı soyqırımına həsr olunmuş “Xocalı uşaqların gözü ilə” adlı tədbir, eyni zamanda “Ayağa dur, Azərbaycan!”, “Şəhidlik zirvəsi – Xocalı” və s. mədəni-maarif tədbirləri marağa səbəb olmuşdur.

Taxtakörpüdə yerləşən Laçın əhalisi üçün MKS-nin təşkil etdiyi kitab sərgisi də maraqlı olmuşdur. Klub müəssisələrinin təşkil etdiyi “Yurdumuza yaz gəlir” adlı tədbir və “İşıqlı” aşıqlar ansamblının çıxışları daim rayon əhalisi tərəfindən maraqla qarşılanmışdır.

Rayon Mədəniyyət və Turizm Şöbəsinin, Laçın şəhər 1 saylı uşaq musiqi məktəbinin və Bakı Dövlət Universitetinin kitabxanaçılıq və nəşriyyat işi kafedrasının təşkilatçılığı ilə 28 aprel 2015-ci il tarixdə Nizami rayonundakı 238 saylı tam orta məktəbin akt zalında ulu öndərimiz Heydər Əliyevin anadan olmasının 92-ci ildönümünə həsr olunmuş “Heydər Əliyev və Azərbaycan mədəniyyəti” elmi-bədii konfransı, Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimovun “Ulu öndər Heydər Əliyev müasir Azərbaycanın memarı və qurucusudur” adlı məruzəsi konfrans iştirakçılarının böyük marağına səbəb olmuşdur. Konfransda fəlsəfə doktoru Knyaz Aslanın, fəlsəfə doktoru Rasim Süleymanovun söylədiyi məruzələr də diqqətlə dinlənilmişdir.

Laçın Rayon Mədəniyyət və Turizm Şöbəsi bundan sonra da öz işini günün tələbləri səviyyəsində qurmaq üçün əlindən gələni edəcəkdir.

**Zabit CAVADOV,**
***“Respublika” qəzeti***

**O KƏND BİZİM KƏNDİMİZDİ**

## ÇORMAN KƏNDİ

Hər birimizin qəlbində doğulduğumuz yerin adı ən əziz, dəyərli kəlmələrdən biridir. Həmin kəlməni elə tərzdə, xüsusi riqqətlə, şəfqətlə, həssaslıq və incəliklə tələffüz edirik ki, səsimizdəki təlaşı, heyrəti ətrafımızdakılar bizdən xəbərsiz hiss edirlər. Bir qrup insanlar üçün belə bir kəlmə Hacısamlı bölgəsinin Qasımuşağı obasının ərazisində olan yaşayış məntəqəsinin adı – Çorman sözüdür. Doğrudur, bu obanın kəndlərinin hər hansı xüsusiyyətini digərlərindən fərqləndirmək mənim üçün nə qədər çətin olsa da, çalışmışam ki, buna nail olum. Hər yurdun-yuvanın, hər elin-obanın özünəməxsus keyfiyyətləri olduğu kimi Çorman kəndinin də öz dünyası, öz aləmi olmuşdur. Ümumi cəhətləri ilə Qasımuşağı obasının qüdrətini, əzmini özündə cəmləşdirən bu kənd bir çox məziyyətləri ilə digərlərindən az-çox seçilmişdir.

**Kəndin tarixi durumu;** Digər toponimlərin bir çoxu kimi Çorman toponiminin (adının) yaranması haqqında bu gün müxtəlif fərziyyələr mövcuddur. El arasında Çorman adlanan bu yaşayış məntəqəsi müəyyən vaxtlarda müxtəlif adlarla adlandırılırdı. Yuxarı Çorman, Təzə Çorman kimi daha çox məşhur olan kənd adından da göründüyü kimi ərazidə bu adda ikinci bir kəndin olduğuna işarə edilir.




Mənbələrdə aparılan araşdırmalardan aydın olur ki, Çorman kəndinin tarixi ərazidə qərarlaşan bir çox yaşayış məntəqələrinin yaranışı qədər də çox uzağa getmir. Buna səbəb yaxın və uzaq ərazilərdə eyniadlı kəndlərin olması, onların zəngin tarixi və xüsusi ilə bu kəndin adının həmin yaşayış məntəqələrinin adından sonra yaranmasına edilən eyhamlardan da (yuxarı, təzə) aydın görmək olar. Yaşlıların söylədiyinə görə Köhnə Çorman kəndinin yaxınlığında yurd yeri olan bu ərazidə Qasımuşağı tayfasının Molla Həsənli tayfasının üzvləri məskunlaşması nəticəsində daimi yaşayış məntəqəsinə çevrilmişdir.

Qeyd edim ki, qədim türk sözü olan "Çorman" mürəkkəb isim olmaqla iki hissədən ibarətdir. Sözün birinci hissəsi olan "çor, çur" sözünün mənası

"igid", "qəhrəman", "güclü" deməkdir. Diqqəti cəlb edən məsələlərdən biri isə təkcə Qasımuşağı obasında deyil, Laçın rayonunda, bəlkə də, bütün yaxın bölgələrdə, əsasən də yaşlı qadınların kiçik yaşlı uşaqlara qarşı işlətdiyi "qarğış"lardan olan zəhər, ağu, zəhrimar, qara ağu, qara yara sözlərinin sinonimi olan çor sözü acı, tünd sözlərinə daha yaxındır.

Çor müəyyən bir oğuz-türk elinin, oğuz-türk tayfasının adı olmaqla yanaşı bir çox toponimlərdə də indiyədək özünü qoruyub saxlamışdır. Yazılı mənbələrə görə Altayda yaşayan türk tayfalarından biri indi də Çor adlanır. Ağstafa çay vadisinin yuxarı hissəsində (İndiki Ermənistan ərazisi) Çor kəngər adlı bir tayfa yaşamışdır. Azərbaycanda Çoryurt (Yardımlı rayonu) və Qəbələ rayonunda Çorlu (bu kəndin bir məhəlləsi məhz Çorlu adlanır), Kəlbəcər rayonunda, Qonqur dağının ətəyində, Əsrik inzibati ərazi vahidində olan Çorman kəndi, Şərqi Anadolunun (Türkiyə) Qara-Çuran (Diyarbəkirin Qaraçorlu mahalı) mahalının olması, Çuratan kəndi (Tovuzda), Sumqayıt inzibati ərazi vahidindəki Corat, Qəbələ rayonunun Mirzəbəyli inzibati ərazi vahidindəki Corlu yaşayış məntəqələrinin adları, eləcə də Cənubu Azərbaycanda və s. yerlərdə də bu gün də mövcuddur.

Türk dünyasının bir çox yerlərində bu ada, bu tayfanın adına rast gəlinir. Yaşadığımız eranın əvvəllərində Azərbaycan Albaniyasında Maskud çarlığının əsas şəhəri müxtəlif mənbələrdə müxtəlif cür "çor/cor/çar/çur/çola/çaq" və s. kimi qeydə alınmışdır. V. V. Bartold Monqolustanda, Aral dənizi sahillərində, Xəzər sahillərində yaşadığımız eranın IV əsrində çor oğuz tayfasının yaşadığını yazır. "Kitabi-Dədə Qorqud" dastanında, "Orxon Yenisey"də, A. Bakıxanovun yazılarında, Q. Y. Məşədiyevin araşdırmalarında və digər türk tədqiqatçılarının əsərlərində çor oğuz-türk tayfaları haqqında xeyli dəlil və sübutlar vardır. Q. Qeybullayev mənşəcə Qafqaz albanlarından olan Alban tarixçisi, Moisey Kalankatlının "Albaniya tarixi" əsərində "Çur" tayfasının adının qeyd olunduğunu yazır.

Lev Qumilyovun "Qədim türklər" adlı kitabı ilə yaxından tanış olduqda məlum olur ki, Çor – Dərbəndin Alban tarixindəki keçmiş adı olmuşdur. Maraqlı məlumatlardan digəri isə "çor" sözünün təkcə yer adı kimi deyil, habelə türk hökmdarlarında titul kimi işlənməsidir.

Təsadüfi deyildir ki, qədim dövrdə yaşamış tayfaların tədqiqi ilə məşğul olan tədqiqatçılar tayfa adlarını müxtəlif qruplara bölürlər. Bu qruplar içərisində Tanrı adlarından, Tanrı elçilərinin adlarından, ruhların adları əsasında, səma və yer cisimlərinin ilahiləşdirilməsi nəticəsində yaranan adlarda vardır. Yazılı mənbələrdə "çor/çar/çur/çola/çaq" və s. kimi qeydə alınmış tayfa adı bu baxımdan "bədxah ruh" adı əsasında yarandığı qeyd edilir.

Azərbaycan dilinin dialektlərində “çor” sözü eyni zamanda "topa" mənasında da işlənir. Odur ki, oronim yaylaq yeri kimi istifadə olunan bu dağda insanların toplaşması ilə də bağlı ola bilər.

Sözün ikinci hissəsi hesab edilən "man" isə yenə qədim türk dillərində "mən, insan, adam" mənasında işlənmişdir. Bir sözlə “çorman” sözünün hərfi mənası "tünd adam, zəhimli kişi" anlamı ilə yanaşı "bu adam çor tayfasındandır", "mən çorlardanam" və s. buna bənzər mənalarda da işlənə bilər.

Ancaq onu da qeyd edək ki, nə Çorman, nə də Köhnə Çorman kənd əhalisinin mənşəyi çor tayfasının üzvləri deyil. Köhnə Çorman (Aşağı Çorman) əhalisinin mənşəyi səlcuq türklərinə, Çorman (Yuxarı Çorman) əhalisinin mənşəyi isə oğuz-türk tayfasının bir qolu olan Qasımuşağı tayfasına mənsubdurlar.

Əvvəllər evlərin sayı az olan kənd bir müddət sonra inkişaf etmiş, evlərin sayı artmış, sakinləri maldarlıqla, əkinçiliklə, bostançılıqla, mahud, xalça, palaz, çuval toxuculuğu ilə məşğul olur, sakinlərin hər biri mülklərə, bağ-bostanlara və biçənəklərə sahib idilər, əlik və dağ keçisi ovlayırdılar. Sənətlərdən xalçaçılıq, silahqayırma və dulusçuluq işləri ilə məşğul olurdular.

**Kəndin mədəniyyəti;** Çorman kəndində həyat və məişət, gündəlik işlərlə bağlı müxtəlif yaradıcılıq işləri əhalinin mədəniyyətində əsas yerlərdən birini tutur. Bu yaradıcılıq ta qədimdən indiyə kimi adi geyimdən müxtəlif bəzək və təsərrüfat əşyalarına qədər olduqca geniş sahəni əhatə edir.

Kənddə kustar üsulu ilə ip əyrilməsi, xalça toxunması bir adət-ənənə halını almışdı. Burada yaşayan insanlar əyirmə, toxuma, hörmə və tikmə işləri arxaik şəkildə aparsa da, gözəl əl qabiliyyətinə malik olmuşlar. Demək olar ki, ailələrin müəyyən hissəsində toxucu dəzgah (hana və yer hanası) var idi. Onlar hazırladıqları yun və pambıq iplərdən xalça, kilim, palaz, keçə, fərməş, xurcun, şəddə, yun şal (parça) və digər xalça məmulatları toxumağı bacarırdılar. Qasımuşağı obasının digər yaşayış məntəqələrində olduğu kimi toxunmuş hazır xalça məmulatları (əsasən xalça və kilim), həmçinin süd məhsulları, yun, dəri, və digər kənd təsərrufatı malları müxtəlif bazarlara, o cümlədən 1905-1907-ci il hadisələrinə qədər Gorus və Qarakilsə bazarlarına satışa çıxarılardı.

Çorman kənd ərazisinin kiçik olmasına baxmayaraq meşələrin təşkil etdiyi ərazilərdə bitən ağacların oduncağından odun, qiymətli inşaat və məişət materialları kimi istifadə edilirdi. Palıd, armud və vələsdən xarratlar müxtəlif məişət əşyaları hazırlayardı. Belə əşyalardan əsasən qab-qacaq, o cümlədən məişətdə geniş istifadə edilən təhnə, tabaq, nehrə, cəhrə, çanaq,

qollu tərəzi, daraq (yun daramaq üçün), hana (xalça toxumaq üçün), yer hanası (şəddə, örkən toxumaq üçün) və s. əşyalar hazırlanırdı.

Çorman kəndi Qarabağ xalçaçılıq məktəbinin xalça toxuma məntəqələrindən biri olmuşdur. Burada gözəl Qarabağ xalçaları toxunurdu. Bu günə qədər qorunub saxlanan Qarabağ xalçaçılıq məktəbinin Cəbrayıl qrupuna aid edilən "Qasımuşağı xalçaları" (el arasında "Ağqol gəbə" ("Ağqol xalça"), "Tikmə gəbə" ("Tikmə xalça") adlandırılırdı) Hacısamlı nahiyəsinin Qasımuşağı obasında (indiki Şamkənd kənd inzibati ərazi vahidində) yerləşən Çorman kəndində də toxunmuşdur. Kənd sakini Xurşudova Dilbər İsmayıl qızının toxuduğu xalça və xalça məmulatları xüsusi ilə fərqlənirdi. Onun toxuduğu "Palaz", "Cecim", "Vərni", "Çələbird" "Qarabağ xalçası", "Atlı, itli xalçaları" və digər xalça və xalça məmulatları göz oxşayırdı. Bu gün də toxunmuş belə xalçalar kənd əhalisinin şəxsi kolleksiyasında saxlanmaqdadır.

Qasımuşağı obasının ərazisində yerləşən Çorman kəndi Ermənistan Silahlı Qüvvələri tərəfindən işğal edilənədək burada məktəb, tibb məntəqəsi, çörək sexi və mağaza fəaliyyət göstərirdi.

Kənd ərazisinin digər kəndlərə, əsasəndə Nağdalı və Şamkənd kəndlərinə çox yaxın olması səbəbindən sovet dönəminin ilk illərində Çorman kəndində ibtidai məktəb fəaliyyət göstərmişdir. Sovet hakimiyyətinin qələbəsindən sonra kənd sakini Teymur Qulu oğlunun şəxsi mülkü olan iki mərtəbəli yaşayış evi müsadirə olunmuş və birinci mərtəbəsi məktəb binası kimi istifadə olunmuşdur. İlk dövrlər kiçik yaşlı uşaqlar dördillik ibtidai təhsili Çorman kənd ibtidai məktəbində aldıqdan sonra yeddiillik təhsil almaq üçün Laçın şəhərinə yollanardı. Bir müddət sonra natamam orta təhsili Şamkənd kənd səkkizillik məktəbində, tam orta təhsili isə Kürdhacı kənd ümumtəhsil orta məktəbində almaq imkanı yarandı. 1968-1969-cu tədris ilində Şamkənd kənd məktəbində yeni siniflərin açılması nəticəsində VIII sinfi bitirən şagirdlər artıq Kürdhacı kənd ümumtəhsil orta məktəbində deyil, Şamkənd kənd ümumtəhsil orta məktəbində təhsillərini davam etdirməli oldular. Bir müddət sonra, 1985-1986-cı tədris ilində yeni məktəb binası inşa olundu. Beləliklə növbəti 1986-1987-ci tədris ilindən sonra kənd uşaqları VIII sinfə qədər öz kəndlərində təhsil almağa başladı.

**Kəndin təbiəti;** Kənd respublikanın paytaxtı Bakı şəhərindən şose yolla 510 km qərbdə, rayon mərkəzindən şose yolla 60 km şimal-qərbdə, Kiçik Qafqaz sıra dağlarında, Qarabağ silsiləsinin cənub-qərb yamacında, civə ehtiyatı ilə zəngin Çilgəzçayın sahilində yerləşir. Xankəndi dəmir yolu stansiyası ilə şose yolla ara məsafəsi 120 km-dir. Cənub tərəfdən Arduşlu, cənub-qərbdən Fərraş, qərbdən Köhnə Çorman, şimal-qərbdən Xaçınyalı, şi-

mal tərəfdən Kürdhacı, şimal-şərqdən Ərikli, şərqdən isə Şamkənd kəndinin ərazisi ilə həmsərhəd olan kənd meşə ilə əhatələnmiş, çay kənarında, uca dağlar qoynunda yerləşmişdir. Xeyli uzaqda isə zirvəsi daim qarlı sıra dağlarla əhatələnən Qırxqız görünürdü.

Hər tərəfi xalı kimi bəzəyən meşə və talalar, gur və sakit axan çaylar, vəhşi heyvanlar və quşlar, iri və xırda bulaqlar, əzəmətli dağlarla əhatələnən dərələr kənd ərazisinə xüsusi gözəllik qatırdı.

Dağların döşündə palıd, vələs, ağcaqayın, göyrüş, qarağac, ardıc, cır meyvələrdən alma, armud, alça, yemişan, qaragilə, giviş, əzgil, həmərsin (itburnu və yaxud dərgil), zirinc və s. ağac və kollardan ibarət, çox da böyük ərazini əhatə etməyən meşə sahələri mövcud idi. Kəndin meşələrində meşə əmələ gətirən əsas ağac cinslərindən ən geniş yayılanı palıd və vələsdir. Bu ağaclar ən qədim dövrlərdən son zamanlara qədər içlik material kimi bütün tikinti işlərində, kənd təsərrüfatı işlərində, məişətdə müxtəlif alət və avadanlıqların düzəldilməsində geniş şəkildə istifadə edilirdi.

Çorman kəndinin ərazisində dünyada möhtəşəm gözəlliyi ilə məşhur olan, el adəti ilə desək; "ortasına (gövdəsinə) örkən dolanmaz", adı "Qırmızı Kitab"a düşmüş nəhəng qırmızı palıd ağaclarına rast gəlinirdi.

Yazda bu yerlərin çəmənliklərinin yaxınlığından ötüb keçən hər kəs məst olurdu. Buranın sıx meşə zolaqları, çox münbit torpağı, əsrarəngiz bitki aləmi tez nəzərə çarpırdı. Yuxarı Çorman və onun ətrafındakı yamaclarında dağ yamaclarına xas olan zəngin dərman bitkiləri – çiyələk, qantəpər, qırxbuğum, əvəlik, quşəppəyi, qazayağı, bağayarpağı, boymadərən, çəmənlərində baldırğan, kəklikotu, qatırquyruğu, çaşır, andız, kənaf, zəyərək, zirə, gicitkən, çobanyastığı, ayıdöşəyi və digər bitkilər quzeyli-güneyli dağdərələrin hakimi idi.

Qasımuşağı obasının ərazisində təbii şəraitin müxtəlifliyi ilə əlaqədar onun canlılar aləmi də çox rəngarəng və həmahəngdir. Bu baxımdan Çorman kəndinin ərazisində ayı, vaşaq, canavar, çaqqal, tülkü, porsuq, gəlincik, cüyür (əlik), çöl donuzu, dovşan, çöl pişiyi və digər bu kimi məməlilər, zığzığ, qaratoyuq, şanapipik, bülbül, ağacdələn, bayquş, cur-cur, sərçə, qaranquş, qartal, quzğun, qızılquş, qırğı, çobanaldadan, bildirçin, alacəhrə, qırmızıdöş, alabaxta, arıquşu (arıqıran), qarğa, ala qarğa, çalağan, sar, kor yapalaq, fır kəklik və s. quşlar, eləcə də müxtəlif növ sürünənlər, xərçəngkimilər, suda-quruda yaşayan bir çox canlılar bu yerlərin sakinləridir.

Kiçik, lakin çox ecazkar bir ərazisi olan kənd ərazisində hər bir xırda yerin özünəməxsus adı var idi. Baş Tala, Orta Tala, Ayaq (Aşağı) Tala, Aşağı fındıqlıq, Almalı Tala, Orucölən, İsmayıl qaçan, Şorun Talası, Farmaş qaya, Yuxarı Dəhnə, Aşağı Dəhnə, Almalıq, Qarapalçıq, Böyük düz, Şərikli

yer, Çitxınalıq, Köşənlər, Qaranın biçənəyi, At qoruğu, Söyüdlü göl, Dəlik daş, Dəlik daşın altı, Sarımsaqlıq, Səslənən qaya, Çəmənli, Çiçəkli, Suarası, Qoruq, Quluazarlayan, Mehralı vurulan, Quş Yuvası, Dik qaya Ağqayanın arası, Şamlıq, Binəli təpə, Çobangüney, Çobanboğulan və s. bu kimi yer adları mövcud idi.

Bostançılığın inkişafına daha çox diqqət yetirən əhali kəndin ərazisində olan axar sulardan gen-bol istifadə edərdi. Bu işdə kəndin tən ortasından keçən Ələkçi çayı əsas yeri tutsa da onun qolları olan Suarası, Qızıl bulaq, Xıdırın binəsindən gələn xırda çaylar da az əhəmiyyətə malik olmamışdır.

Qırxqız dağının ətəklərində yerləşən Çorman kəndinin ərazisində digər tərəfi görünməyən sıx meşələrdə saysız-hesabsız, tükənməyən buz bulaqlar qaynayırdı; Qoşa bulaq, Qəşəm bulağı, Nəzərin bulağı, Yuxarı dəhnə bulağı, Aşağı dəhnə bulağı, Qızıl bulaq, Orucölən bulaq, Almalı tələ bulağı, Şərik yer bulağı, Quzey bulaq, Mamasalan bulaq, Bağça bulaq, At bulaq, Şirxanın bulağı, Göy dərə bulağı. Hər birinin öz dadı, öz soyuqluğu və öz dəyəri vardı burada yaşayan insanlar üçün.

Bu yerlərin mürəkkəb relyefi, sərt iqlimi bütün amillərə öz təsirini göstərir. Burada iqlim yayda sərin, qışda soyuq olur. Orta illik temperatur 01°C ilə 08°C arasında dəyişir. Yağıntıların illik miqdarı 700-800 mm-ə qədər olur.

**Camaatın ictimai həyatı;** Kənd əhalisi milliyətcə azərbaycanlılardan ibarətdir. Kənddə yaşayan əhali ümumilikdə Qasımuşağı tayfası adlandırılır. Kənddə əsasən bu tayfanın Molla Həsənli və İbrahimuşağı tirələri məskunlaşmışdır.

XVIII yüzilliyin sonu XIX yüzilliyin əvvəllərində Qərbi Azərbaycanda baş vermiş təkmillətli Ermənistan Respublikası yaratmaq məqsədi ilə oradan deportasiya edilmiş bir neçə azərbaycanlı ailə Çorman kəndində məskunlaşmış, burada yaşayan əhali ilə qaynayıb qarışmışlar.

Kənd sakinlərindən Qulu Məşədi Allahverdi oğlu öz qoçaqlığı, fərasəti ilə sayılıb-seçilirdi. Hacısamlı nahiyəsinin bəyi, bölgədə müdrik kəlamlar ustadı Paşa bəy Sultanovla yaxın münasibəti olmuş, hətta bəzi məsələləri birlikdə müzakirə etmişdilər. Qulu hər zaman düşünüb, daşınıb danışmağın tərəfdarı olmuşdur. Onun "Bir məclisdə söz söyləmək istəyəndə gözünü məclis əhlinin üstündə üç dəfə dolandır, söyləmək istədiyin söhbəti dilinin ucuna üç dəfə gətir-qaytar, düşün, sonra söylə" kəlamı bu gün də Çorman və ətraf kənd sakinləri arasında söylənməkdədir.

Hacısamlı nahiyəsinin bəyi Sultan bəy Sultanovun ən yaxşı sərkərdələrindən biri olmuş Teymur artıq 1887-ci ildə ad-san qazanmış, çörəyi, süfrəsi ilə tanınırdı. Əvvəlcə kənddə on başı, yüz başı olan Teymur Qulu oğlu

(el arasında Temiryüzbaşı kimi tanınırdı) Tiflisdə gimnaziyanı qurtarmışdı. Rus və ərəb dilini öyrənmişdi. Rəvan Quran oxumağı bacarırdı. 1905-1907-ci illərdə baş vermiş erməni-müsəlman davasında bir sərkərdə kimi hər zaman öndə olmuş, erməni silahlılarının tutduğu möhkəm mövqelərinin darmadağın edilməsində yaxından iştirak etmişdir.

Azərbaycana Sovet hakimiyyətinin gəlişi ərəfəsi və qələbədən sonrakı dövrlər yeknəsəq faciələrin aramsız təkrarı ilə kənd sakinlərinin yaddaşında dərin izlər saldı. Belə ki, Qırmızı Ordu Qasımuşağı obasının ərazisinə daxil olan gündən təqib və repressiya qurbanları meydana çıxdı. SSRİ-nin bu obaya vurduğu ən böyük zərbə isə ziyalı təbəqəsinin məhv edilməsi ilə nəticələndi.

Kənddə yaraşıqlı ikimərtəbəli ev inşa etdirmiş, xeyli mülk və təsərrüfata, xırmanlara sahib olan Allahverdiyev Teymur Qulu oğlu (Temiryüzbaşı) 1921-ci ildə rəvac götürən repressiyaya tuş gəldi. Mülk-malı müsadirə olundu. Təəssüf ki, ölümündən xeyli sonra bəraət alan Teymur Qulu oğlunun evinin ikinci mərtəbəsi onun nəvələrinə qaytarıldı.

1921-ci ildən başlayan və 1938-ci ildə yekunlaşan, şəxsiyyətə pərəstişin, təqibin, təzyiqin və repressiyanın bütün cəmiyyəti əhatə etdiyi zaman kəsiyində və istərsə də ondan sonrakı dövrlər də gecələri qorxu və səksəkə içərisində yuxuya gedib, səhərləri öz daxmalarında sağ-salamat qarşıladıqları üçün şükür edən kənd əhalisi həyatlarını hürkü-qorxu altında davam etdirirdilər. Allahverdiyev Gəray Qulu oğlu, Allahverdiyev Teyyub Qulu oğlu, Zeynalov Lətif Mahmud oğlu, Şahmuradov Ağarza Şahmurad oğlu, Allahverdiyev Abdüləzim Hüseyn oğlu, Allahverdiyev Murad, Allahverdiyev Səmayə, Həşimov İsa Həşim oğlu bu repressiyaların qurbanı oldu.

SSRİ tarixinə "Böyük Vətən müharibəsi" kimi daxil olmuş, bəşər tarixinin ən dəhşətli müharibəsi sayılan İkinci Dünya müharibəsi bu kəndə böyük zərbə vurdu. Bu müharibə dövründə Çorman kəndinin mərd oğul və qızları azərbaycanlılara xas olan ən ali və gözəl keyfiyyətlərini – fədakar, vətənpərvər, sarsılmaz, mərd olduqlarını həm ön cəbhədə, həm də arxa cəbhədə sübut etməyə çalışdılar. Kənd sakinlərindən Şahmuradov Kamran Ağarza oğlu, Şahmuradov Qırımxan Ağarza oğlu, Şahmuradov Kərimxan Ağarza oğlu, Şahmuradov Şirasdan Ağarza oğlu, Zeynalov Behbud Mahmud oğlu, Həsənov Xıdır Mahmud oğlu, Nəcəfov Əfrə Nəcəf oğlu, Nəcəfov Səlim Nəcəf oğlu, Allahverdiyev Maqsud Qulu oğlu, Nəsibov Hümbət Ağamalı oğlu, Novruzov Tapdıq Abdulrəhman oğlu, Xurşudov Məndil Rəfi oğlu, Xurşudov Əvəz Rəfi oğlu, İsmayılov Əhəd Çərkəz oğlu və digərləri Böyük Vətən müharibəsinin alovlandığı ilk dövrlərdən könüllü olaraq vətənin

müdafiəsinə qalxmış, cəbhəyə yollanmış, qızğın döyüşlərdə layiqincə iştirak etmiş və onlardan bir çoxu döyüşlərdə həlak olmuşdular.

Ermənilərin başlatdığı dəhşətli Qarabağ müharibəsinin ilk günlərindən Çorman kəndinin əhalisi – uşaqlı-böyüklü hər kəs vəziyyətin ağır olmasına baxmayaraq öz bacardığıköməkliyi göstərməyə çalışmışdır. Qarabağ müharibəsində iştirak etmiş və Azərbaycanın müstəqilliyi, ərazi bütövlüyü uğrunda gedən döyüşlərdə şəhidlik zirvəsini fəth edən fateh Quliyev Camal Möhübbət oğlu olmuşdur.

Dini mənsubiyyətinə görə kənd sakinləri müsəlmandırlar və islam dininin şiə təriqətinə mənsubdurlar.

2009-cu il dekabr ayına olan məlumata əsasən kənd sakinlərinin sayı 332 nəfər (85 ailə), 2015-ci ilin yanvar ayında aparılan siyahıyaalma zamanı isə kənd sakinlərinin sayı 345 nəfərdir (93 ailə).

**Əhalinin məşğuliyyəti;** Kənddə məskunlaşmış əhalinin bir hissəsi qışlaq və yaylaq şəraitindən istifadə etməklə heyvandarlıqla məşğul olurdular. Kəndin iqtisadiyyatında başlıca sahə heyvandarlıq, qismən isə arıçılıq və əkinçilik olmuşdur. Deportasiyaya qədər elə ev olmazdı ki, qapısında mal-qara, qoyun-quzu olmasın. Kənd ərazisinin kiçik olması səbəbindən kəndin iqtisadiyyatı çox güclü inkişaf etməmiş, bu səbəbdən də əkinçilik çox az yeri əhatə etmişdir. Ərazidə təbii ot biçənəkləri mövcud idi. Qırxqız yaylaqlarının ətəyində məskunlaşmış əhali yaz aylarında yaylağa qalxardı.

1960-cı illərin sonunda hava yolu ilə elektrik xəttinin çəkilişi, avtomobil yolunun yaxşılaşdırılması nəticəsində kənddə vəziyyət yaxşılığa doğru xeyli dəyişdi. Kənd əhalisi müxtəlif məqsədlər (qida, dərman və texniki) üçün meşədə bitən cır meyvə və giləmeyvələrdən meyvə qurusu (qax) hazırlayardılar. Dülgərlik, dəmirçilik, bənnalıq, rəngsazlıq, toxuculuq və digər sahələr vaxt və dövrdən asılı olaraq müxtəlif cür inkişaf etmişdir. Dərman bitkilərinin toplanıb istifadə edilməsi əhalinin məşğuliyyət növlərindən birinə çevrilmişdir.

Kəndin ərazisində sıx meşə zolağının mövcud olması odun istehsalına imkan yaradırdı. Əhəng daşı yandırmaq (istehsal etmək), eləcə də kömür istehsalıda bu kənddə məşğuliyyət növlərindən biri idi. Kənd ərazisi Ələkçi çayının sahilində yerləşdiyindən burada əməksevər əhali ətraf kəndlərə nisbətən bostançılıq və bağçılıqla daha çox məşğul olurdu. Kəndin bağ və bostanları əvvəllər arx vasitəsi ilə suvarılırdı. 1980-ci illərin axırında dəmir və plastmas borularla kəndə su xətləri çəkilmişdir.

Hacısamlı bölgəsində yerləşən digər kəndlər kimi Çorman kəndinin də başı zaman-zaman çox müsibətlər çəkmişdir. Yüz illər boyunca bu torpağa göz dikən yadellilər hər dəfə qəhrəman Vətən övladları tərəfindən qovulub

geri qaytarılsa da, 1992-ci il may faciəsi Çorman kəndinin tarixinə iri qara hərflərlə yazıldı.

18 may 1992-ci il tarixdən başlayaraq Ermənistan dövləti kəndin köklü sakinləri olan azərbaycanlıları tarixi-etnik torpaqlarından məcburi köçkün salmağa başladılar. 29 may 1992-ci il tarixə qədər kənd əzab-əziyyətlə müdafiə olunsa da, sonda Ermənistan Respublikası Silahlı Qüvvələri tərəfindən zəbt olunaraq yaşayış evlərinin əksəriyyəti yandırmaqla işğalın ilk mərhələsini reallaşdırdı. Lakin Azərbaycan Silahlı Qüvvələri tərəfindən yenidən azad edilən kənddə yaşayış yenidən bərpa edilsə də, 02 aprel 1993-cü il tarixdə Kəlbəcər rayonunun işğalından sonra mühasirədə qalan sonuncu kənd sakinləri məcburən rayon ərazisini tərk etdilər. Beləliklə, kənd sakinlərinin həyatına yeni bir dövr – məcburi köçkünlük həyatı qədəm qoydu.

Beləliklə, məcburən, silah gücünə köçürülən kənd əhalisi sərin, səfalı yaylaqları, göz yaşı kimi büllur bulaqları, al-yaşıl bağ-bağçaları, doğma ev-eşiklərini, dədə-baba yurdlarını gözü yaşlı tərk etdilər. Kənd əhalisi Azərbaycan Respublikasının müxtəlif bölgələrində məskunlaşdı. Həmin dövrdən 20 ildən artıq vaxt ötmüş, kəndin keçmiş adət-ənənələri itib-batmaq üzrədir. Hətta gənc kənd sakinlərinin bir çoxları, yaxın qohumlar belə bir-birini tanımır.

İşğaldan bir xeyli sonra Xaçınyalı kəndini – Xaçın tap, Piçanis kəndini – Vakunis, Hacısamlı kəndini – Vazgenaşen, Şamkəndi kəndini – Şamk adlandıran ermənilər Çorman kəndinin də adını dəyişib Çormank etmişlər. 2005-ci ildə işğal altında olan ümumi Qarabağ ərazisində ermənilər tərəfindən əhalinin siyahıyaalınması zamanı Çormanda yaşayışın olmadığı məlum olur. 2010-cu ilin peyk görüntülərindən də ərazidə yaşayışın olmadığı bir daha aydın olur.

Ümidsiz, inamsız yaşayan hər bir insan görünüşcə möhtəşəm olan, amma bünövrəsi olmayan bir tikiliyə bənzər. Hər hansı bir yüngül zərbənin nəticəsində əzilər, məhv olar. Dəniz səviyyəsindən təxminən 1750 metrdən artıq yüksəklikdə yerləşən, Azərbaycanın ucqar yaşayış məntəqələrindən biri olan Çorman kəndinin sakinləri hələ də Vətənə dönəcəkləri günü çox böyük ümidlə gözləyirlər.



**Sultan HÜMBƏTOV**

**POEZİYA**



**Səyyah MƏHƏMMƏD**

## TƏZƏ İLDƏ

Arzum insanlara cansağlığıdır,
Bir də xoşbəxt həyat, var təzə ildə.
Hər yanı bürüsün şənlik, toy, büsat,
Evlərdə dinlənsin tar təzə ildə.

Daha gözəlləşsin bugünkü həyat,
Arzu çiçəkləsin, açaq qol-qanad.
Bakı, Alma-Ata, Daşkənd, Aşqabad,
Olsun daha möhkəm yar təzə ildə.

Susuz torpaqlara sular çəkilsin,
Tarlalarda hər növ məhsul əkilsin.
Vətənim sevilsin, elim sevilsin,
Bağları bəzəsin bar təzə ildə.

*Laçın qəzeti №1,*
*01 yanvar 1969-cu il*

## DƏYMƏSİN

**(*Böyük Vətən müharibəsi zamanı cəbhədə yaralanmış əsgərin anasına məktubu*)**

Vətən davasında vurdu haramı,
Yellər əsdi sızıldatdı yaramı.
Payızın çovğunu, qışın boranı
Mənə dəysin, nazlı yara dəyməsin!

Yaralandım, ana, aprel ayında,
Yudum öz qanımı Oxa çayında.
Üzü tutqun günəşin də, ayın da,
Həkimlər eyləsin çara, dəyməsin!

Qızıl qan ağ qarda andırır gülü,
Görsə, valeh edər şeyda bülbülü.
Gözüm qabağında azəri eli,
Heç kimsəyə dəmir-paya dəyməsin!

Beş qızın qardaşı tək İsfəndiyar.
Vuruldu, sinəmdə yüz min dağı var.
İgid oğlanlara məzar olan qar,
Əritməsin, günəş qara dəyməsin!

Heyif sənə, Qarabağlı ər Səfər,
Ömründə bilməzdi nə qəm, nə kədər.
Vətən həsrətində hər axşam-səhər
Həsrət könüllərə qara dəyməsin!

Qəlbimdə bir cütdür Vətənlə ana,
Hər çətinlik qismət olar insana.
Ölərsəm, qurbanam Azərbaycana,
Yad ayaqlar o diyara dəyməsin.

*Laçın qəzeti №32,*
*15 mart 1969-cu il*

## SARI AŞIĞIN MƏZARI ÜSTÜNDƏ

Elə bil ki, sağdır, çalır sazını,
Qulaq asır Yaxşı yarı Aşığın.
Tərsinə qoyulub özünün yönü,
Bu, öz əhdi olub Sarı Aşığın!

Üstündəki hasar ona nişana,
Sözləri yaraşıq toya, nişana,
Dünya, bumu vəfan hər gözəl cana,
Təkcə qalıb ahu-zarı Aşığın.

Xəbər deyim onun doğma elindən,
Qəbri üstə tökdüm gözüm selindən.
Əhval bildim bir qarının dilindən,
Söylədi bəxtini qarı Aşığın.

Seçərkən dünyada ağla qaranı,
Sinəsinə sevgi vurmuş yaranı,
Həkəri kəsibdi iki aranı,
Bağ salıb, verməyib barı Aşığın.

Xəyalı seyr edib dağı, aranı,
Dərdinə tapmayıb fəqət çaranı.
Sevməyibdi malı, mülkü, paranı,
Eşq olub dövləti, varı, Aşığın**.**

*Laçın qəzeti № 62,*
*22 iyun 1968-ci il*

**Təqdim etdi:**
**Bəxtiyar KAVANLI**

**OVQAT**

## QAÇQIN YATAQXANASINDA MAHNI OXUYAN QOCA

Xoş o bəndənin halına ki, gücü gəldikcə bağırıb-çığırır, ağlaya bilir. Bədbəxt o insandı ki, dərdi içini yeyir, heç kimlə ağrılarının yükünü bölüşə bilmir.

Yaşlı, dərddən yumağa dönən insanların əzabına dözmürəm. Onların ötüb-keçən ömrünə, əziyyətlərinə heyfim gəlir. Yaşadığım binada beləlerinin sayı çoxdu. 23 il əvvəl bu yaşayış məkanına – "Qaçqın yataqxanası"na pənah gətirənlərin gəncliyini illər əlindən alıb, qocaldıb. O yaşlılardan biri daha çox diqqətimi çəkir. Həyatın əzə-əzə güclü etdiyi bu adamı ya binanın həyətində var-gəl edən görərəm, ya da oturub məchul bir nöqtəyə baxan.

Hərdən ağacın kölgəsində, daşın üstündə oturub, zümzümə edir astaca... Bilmirəm laylamı deyir, yoxsa ağı. İnsanı sarsıdacaq ağrı, hüzn, yanğı dolu bir iniltiyə bənzəyir əslində onun oxuduqları. Oyuncağı əlindən alınmış uşağa bənzədirəm onu. Vətəndən ayrıdı, doğma torpağa həsrət qalıb. Müharibə onu evindən, yurdundan didərgin salıb. Nə etsin, əlacsızdı. Bu kabusa,

"Dur!" deməyə, haqqı varsa da, gücü yoxdur. Torpağının xiffətini çəkə-çəkə torpaq olmağa yol alıb.

Xoş o bəndənin halına ki, gücü gəldikcə bağırıb-çığırır, ağlaya bilir... O adam da ağlayır, amma astaca. Özünün, bir də Allahının eşidəcəyi bir səslə. Qaçqınlığına, köçkünlüyünə, əsir düşənlərinə, şəhidinə, işğal olunmuş torpaqlarına ağı deyir.

Çox istəyərdim o qocanı çal-çağır verilişlərinin birinə dəvət etsinlər. Zarafat etmirəm, ciddi sözümdür. Oxumağı bacarıb-bacarmayan, səsi olmasa da, özünü tamaşaçı qarşısında həlak edən müğənnilərin yanında əyləşdirsinlər. Çox yox, bir dəfə imkan versinlər. "Qarabağ şikəstəsi", "Şuşanın dağları", "Laçınım" və sair mahnıları dinləmək istəyənlər üçün o kişi zümzümə etsin. Çünki heç bir "ulduz" müğənni vətən ağrısını onun qədər yanıqlı ifadə edə bilməyəcək. O, minlərlə qəriblik ağrısı çəkən insanın harayıdı, səsidi.

Zövqü baltalayan musiqiləri, mahnıları dinləyib, qan-tər içində alqışlamaqdan əlləri qabar olan, hansı havaya oynadığını bilməyən adamlar o harayı dinləməyəcəklər. Ona görə ki, yalançı pafos, dəbdəbə, təmtəraq yoxdur o səsdə. Müharibə, şəhid, torpaq dərdi var.

Bu dərdi özünə sirdaş edənlər sakit köçər gedər bu yer üzündən. Qulağını çal-çağırdan kar edib, oynayanlar: yorulmayasız, nə deyim. Sizə bir əhvalat danışım yeri gəlmişkən.



Bir gün uşaq məktəbdən evə gəlib sevinə-sevinə atasına deyir ki, dörd dərsdən "2", nəğmədən isə "5" qiymət almışam. Ata oğluna sual verir:

Bir gündə düz dörd dərsdən sən iki ala-ala,

Necə həvəsə gəlib mahnı oxudun bala?

Həvəsinizə heyranam, əzizlərim.

**Qönçəgül KAMALQIZI**

**ZİYALILARIMIZ**



## LƏYAQƏTLİ MÜƏLLİM ÖMRÜ

Müasir Azərbaycan dövlətinin bütün sahələrində olduğu kimi təhsilində də böyük uğurları, nailiyyətləri var. Ulu öndərimiz, müstəqil, demokratik ölkəmizin ümummilli lideri Heydər Əliyev demişdir: "İnsan təhsilinin əsasını orta məktəbdə alır. Əgər onun fundamental, köklü orta təhsili varsa, o, cəmiyyətdə özünə yer tapacaq, çalışacaq... cəmiyyətimizin şüurlu üzvü olacaqdır".

Bu kəlamlarda çox böyük həqiqət var. Təhsilin əsası, bünövrəsi orta məktəbdə qoyulur. Təhsilin möhkəmlənməsi, sistemli şəkildə öyrədilməsi isə müəllimlərin üzərinə düşür.

Bütün peşələr gözəldir. Sevdiyin peşənin sahibi olmaq, onunla bağlı gördüyün işlərin məsuliyyəti ilə yaşamaq daha gözəl, fəxr olunasıdır. İstər mühəndis, həkim, geoloq, jurnalist, arxeoloq, istərsə də fəhlə olsun, fərqi yoxdur. Hər bir insan əlifbanı bilməli, oxumağı, yazmağı bacarmalıdır. Bütün bunları isə bizə öyrədən, ana, Vətən kəlmələrini əlimizdən tutub yazdıran, ətraf aləm haqqında düzgün istiqamət verən, mükəmməl biliyə malik müəllimlərdir.

Müəllim! Bu adı daşımaq, ona layiq olmaq, həqiqətən çox yüksək və şərəflidir. Ziyalı təbəqənin formalaşması müəllimlərdən asılıdır. Müəllim öz biliyini şagirdlərinə aşılamalı, onları düşündürməli, dərslə bağlı hər hansı problemin həll olunmasında şagirdləri sərbəst buraxmalı, elmə gedən yolların açılmasında müntəzəm iştirak etməlidir.

Hansı xalqın ziyalısı çoxdursa, irəliləyiş, yüksəliş, tərəqqi də onundur. Elm və texnikanın inkişaf etdiyi bir dövrdə yaşayırıq. Ona görə də müəllimlər daim axtarışda olmalı, yeniliklərlə addımlamalı, savadlı şəxsiyyətləri formalaşdırmağa qadir olmalıdırlar.

Müəllimlik o qədər müqəddəs bir peşədir ki, çox məsuliyyət tələb edir. Həmişə yüksək dəyər verilən bir sənət olub. Hətta tarixi şəxsiyyətlər, dünyanı fəth edən fatehlər belə müəllim adına hörmətlə yanaşmış və qiymətləndirmişlər.

İnsan arzularla yaşayır. Arzusuz insan qanadsız quş kimidir. İnsanların arzularının gerçəkləşməsində müəllimlər xüsusi rol oynayır. Əsl müəllim sinfə girəndə öz problemini unudub, yalnız şagirdlərlə məşğul olmalı, həm

əqidəsi, ağlı, səbirli olması, səliqəli, təmkinli, anlayışlı, sadə, təvazökar, qətiyyətliliyi ilə seçilməlidir.

*Siması nurlu,*
*Zəkası iti.*
*Ədəb-ərkanı,*
*Həm əqidəsi*
*Əlçatmaz zirvə*
*İlk müəllimin.*

*Həyat yolunun*
*Eniş-yoxuşun*
*Öyrətdi bizə.*
*Zülmətdən nura*
*Qərq oldu dünya*
*Mehriban insan,*
*İlk müəllimin.*

Laçın rayonunun Mişni kənd orta məktəbinin müəllimləri də əsl ideal müəllimlərdir. Məmmədov Vahid – direktor, müəllimlər Qarayev Ramazan, Qarayev Misir, Xanlarov Surxay, Aslanov Qənbər, Verdiyeva Töhfə, Heydərov Cavad, Fərzəliyeva Güleyşə, Heydərova Güllü, Nəcəfova Piyalə, Orucov Nurəli, Mirzəyev Ağca, Məmmədova Arifə, Kərimova Xalidə, Qarayev Elşad, Mirzəyeva Zemfira, Mirzəyeva Venera, Nəcəfquliyev Tahir, İbrahimov Varaşil, Alıyeva Mərziyyə, Heydərov Azad, Yusifova Güllər, Məmmədova Flora.

İbtidai sinif təhsilin bünövrəsini, özülünü təşkil edir. Heydərova Güllü, Fərzəliyeva Güleyşə, Qarayev Ramazan, Orucov Nurəli, Nəcəfova Piyalə şagirdlərin ilkin bilik-bacarıqlarını, qabiliyyətlərini elə inkişaf etdirirdilər ki, onlar məktəbə yalnız yaxşı oxumaq həvəsi ilə gəlirdilər. Hər bir şagirdin əlindən tutub yazı yazdırmaq, hesablamanı öyrətmək, bir çox bacarıqları formalaşdırmaq həqiqətən də fədakarlıqdır.

Söz açdığım müəllimlərin hər biri mənim üçün müqəddəs, unudulmayan ideal müəllimlərdir. Həmin məktəbdə işləmiş, əvəzedilməz olanlardan biri də ömrünün 58 ilini müəllimliyə həsr etmiş Mişni kənd orta məktəbinin metodist müəllimi Qarayev Ramazandır. Müəllim adının necə yüksək, məsuliyyətli olduğunu, bu sənətə vurğunluğu, sevməyi öyrətdiyi üçün həm müəllimim, atam Qarayev Ramazana və bütün müəllimlərimə minnətdaram. Onlara minnətdaram ki, Vətənimizə savadlı kadrların hazırlanmasında xüsusi rol oynamışlar.

Qarayev Ramazan 1933-cü ilin Ramazan ayında Laçın rayonunun Mişni kəndində kolxozçu ailəsində anadan olub. Atası İlyasov Məcid Qara oğlu kənd təsərrüfatının müxtəlif sahələrində, əsasən, əkinçilik sahəsində işləyib. Anası İlyasova Sayad Cəfər qızı evdar qadın olub. Anası güclü yaddaşa malik olub. Nağıllarımızı, bayatılarımızı çox gözəl bilirdi. Sovet dövründə

kənddə yeganə qadınlardan idi ki, namaz qılır, oruc tuturdu. Ailədə bir qız (Qarayeva Sona) və dörd oğlan (Ramazan, Oruc, Misir, Rəhim) böyüyürdü. Belə bir vaxtda uşaqlara təlim-tərbiyə vermək, onları yedirtmək, geyindirmək çox müşkül məsələ idi. Belə çətin vəziyyətdə uşaqlara düzgün tərbiyə vermək, gələcəkdə yaxşı vətəndaş yetişdirmək hər valideynin işi deyildi. Məcid kişi övladlarını ədalətli olmaq, heç kəsin əmlakına göz dikməmək, namus və qeyrətlə yaşamaq ruhunda tərbiyə edirdi. Elə bu tərbiyənin nəticəsi idi ki, övladları heç kimin köməyi olmadan elin hörmətini qazandılar.

Qarayev Ramazan kiçik yaşlarından əməklə məşğul olmuşdur. Bütün sahələrdə ata-anasına kömək etmiş, belə ağır günlərdə həm işləyib, həm də oxumuşdur. O, 1939-1940-cı tədris ilində Mişni kənd ibtidai məktəbinin 1-ci sinfinə gedib. İlk müəllimi Qalaça kəndindən Şərəfxan müəllim idi. Dərs ləvazimatları yox dərəcəsində idi. O vaxt yazını kəndalaş adlı bitkinin toxumundan düzəldilmiş rənglə yazırdılar. 1-ci sinifdən 4-cü sinfə qədər sinifdən-sinfə əla qiymətlərlə keçib. Əla oxuduğuna görə 1-ci sinifdən 3-cü sinfə, 3-cü sinifdən 5-ci sinfə keçiriblər. Məktəb sonralar yeddi illik olub. 7-yə qədər bütün sinifləri əla qiymətlərlə bitirib.

1949-cu ildə 7-ci sinfi əla qiymətlərlə bitirdiyinə görə onu Laçın Pedaqoji Texnikumuna imtahansız qəbul ediblər. Dörd il Laçın Pedaqoji Texnikumunda oxuyub. Oxuduğu müddətdə özünü işgüzar, tərbiyəli, məktəbin işlərində fəallıq göstərən bir tələbə kimi aparıb. Həmişə müəllimləri onu digər tələbələr üçün nümunə göstəriblər.

O, 1954-cü ilin yayında Məmmədov Vahidlə APİ-nin kimya-biologiya fakültəsinin qiyabi şöbəsinə imtahan verib qəbul olur. Yayda 1 ay oxuyur, 2 zaçot verir. 1954-1955-ci tədris ilində qiyabi oxuduqlarına görə öz işlərini davam etdirirlər. Oktyabr ayının 28-də onu ordu sıralarına göndərirlər. Əsgərliyə getdiyinə görə institutda təhsili yarımçıq qalır. Əsgərlikdən gələnə kimi hökumətin qərarı ilə kimya-biologiya fakültəsi bağlanır. Həmin fakültədə təhsilini davam etdirə bilmir. 1959-cu idə APİ-nin pedaqogika və ibtidai təhsilin metodikası fakültəsinə daxil olur, 1965-ci ildə isə təhsilini başa vurur.

1969-cu ildə Mişni kənd orta məktəbinə tədris işləri üzrə direktor müavini təyin edilir. Həmin vaxt məktəbin direktoru Məmmədov Vahid idi. 1984-cü ildə Təhsil nazirinin əmri ilə Metodist müəllim fəxri adına layiq görülür.

İşlədiyi müddətdə həmişə məktəbin adı qabaqcıllar sırasında çəkilib. Həmin məktəbi bitirən yüzlərlə şagird ali və orta ixtisas məktəbini bitirərək müxtəlif sahələrdə fəaliyyət göstərirlər. Mirzəyev Fuad, Məmmədova Flora, Hüseynov Ərşad, İbrahimov Arif, Əsədov Hamlet, Məmmədova Təranə,

İbrahimov Polad, Həsənov Fəzail, Həsənov Telman, Nadirov Pərviz və s. müxtəlif sahələrdə işlərini davam etdirirlər.

Məktəbin pedaqoji kollektivi bütün pedaqoji üsullardan istifadə edərək məktəbi rayon üzrə qabaqcıllar sırasına çatdırmışdır. Məktəbin belə inkişaf edib şöhrət qazandığı bir vaxtda Qarabağla bağlı hadisələrə görə işlər yarımçıq qalır. Didərgin düşmüş məktəb Qaradağ rayonunun Sahil qəsəbəsindəki 253 №-li məktəbin bir hissəsində məskunlaşdı. Yenə kənddə olan müəllimlərin əksəriyyəti bu məktəbdə fəaliyyətlərini davam etdirirlər. Məktəbin kənddəki öncüllüyünü burada da davam etdirirlər. Məktəbimiz yenə Laçın məktəbləri içərisində liderliyini saxlayır. Hər il məktəbimizin onlarla məzunu ali məktəblərə qəbul olaraq tələbə adını qazanır.

Prezidentimizin göstərişi və qayğısı sayəsində Ümid qəsəbəsində Laçın rayon 7 №-li tam orta məktəbi üçün müasir, bütün pedaqoji tələblərə uyğun məktəb binası tikdilər. Kollektivimiz öz ənənələrinə sadiq qalaraq pedaqoji fəaliyyətlərini davam etdirir.

Laçın Rayon Təhsil Şöbəsi məktəbimizə lazım olan bütün metodiki və pedaqoji cəhətdən lazımi köməkdarlıq edir. Pedaqoji kollektiv Laçın rayonunun icra başçısının köməyini həmişə öz üzərində hiss edir. O il olmaz ki, icra başçısı məktəbimizdə 3–4 dəfə olmasın. Pedaqoji kollektivə lazım olan köməyini edir və imkan daxilində tələblərini ödəyir.

Ramazan müəllimə sual verəndə ki, ən yaddaqalan şagirdləriniz kimlər olub; Bu sualı əsl pedaqoq kimi cavablandırdı. Bütün şagirdlərim yaddaqalandırlar. Heç vaxt şagirdlər arasında ayrı-seçkilik qoymamışam. Onların qazandıqları uğurlara sevinmişəm. Uğursuzluq əldə edənlərə görə isə çox narahat olmuşam. Ən intizamlı şagirdlərinin bir neçəsinin adını güc-bəla ilə öyrəndim. Özünün həddən ziyadə təvazökar olmağı dərs dediyi şagirdlərdə də özünü büruzə verir. Hüseynov Şakir, İbrahimov Məmmədcəfər, Hüseynov Ərşad, İbrahimova Zemfira, Nəcəfova Rəfiqə, Mirzəyev Tofiq, Xanlarova Ziyafət əla oxumaqları və nizam-intizamları isə daima fərqləniblər.

Ramazan müəllim 2011-ci ildə yaşa görə təqaüdə çıxıb. Amma yenə Laçın rayon 7 №-li tam orta məktəbi ilə maraqlanır, onun fəaliyyətinin yüksək olması ilə həmişə fəxr edir. Əmindir ki, pedaqoji kollektiv uzun müddət qazanılan bu müvəffəqiyyəti bundan sonra da davam etdirəcək.

Ramazan müəllim və qardaşı Misir müəllim peşələrini o qədər sevirlər ki, hər ikisi təqaüddə olsa da, həmişə təhsillə bağlı yeniliklərlə maraqlanır, əsl müəllim adını qoruyub saxlayırlar. Misir müəllimin övladı Qarayeva Tamella çox böyük ustalıqla Azərbaycan dilinin sirlərini şagirdlərə öyrədir, atasının yolunu davam etdirir.

Peşələr içərisində bəlkə də ən çətini və şərəflisi müəllimlikdir. Müəllim ən vacib pedaqoji mərifətə malik olmalıdır. Müəllim təkcə sinifdə deyil, həyatın hər yerində müəllim olmalıdır. Pedaqoji mərifəti gözləməyən müəllimdən heç vaxt yaxşı pedaqoq olmaz. Pedaqoq bilməlidir ki, onun etdiyi hərəkət, danışdığı sözlər şagirdlərin gözü qarşısında olur. Ona görə də istər sinifdə, istərsə də sinifdən kənarda özünün bütün hərəkətlərinə fikir verməlidir. Müəllim bilməlidir ki, onun hərəkətləri şagirdlərin gözü qarşısında güzgüdəki kimi əks olunur. Bunu da şagirdlər əyani şəkildə görürlər. Müəllim bütün sahələrdə, geyimində, səliqəliliyində, davranışında, münasibətində şagirdlər üçün nümunə olmalıdır.

Hansı mütəxəssis işə başlayanda yaxşı işləyirsə, tapşırığı dəqiq yerinə yetirirsə, onun haqqında deyirlər ki, halal olsun sənə təlim və tərbiyə verən müəllimə. Müəllimlik peşəsini qəbul edən müəllim əmək haqqının çoxluğuna və azlığına görə deyil, peşəsinin adına görə daha yaxşı işləməlidir.

*Ağarmış saçların zirvəyə bənzər,*
*O nurlu sifətin Günəşə bənzər.*
*Hər sözün, söhbətin qızıla bənzər,*
*Coşqun bir dənizə, ümmana bənzər*
*Müəllim həyatın, müəllim ömrün.*

*Elmlə ucaltdın müəllim adını,*
*Qorudun, qorudun məslək adını.*
*Yaşatdın daima bu amalını,*
*Coşqun bir dənizə, ümmana bənzər*
*Müəllim həyatın, müəllim ömrün.*

Müəllimliklə bərabər hər işə canıyananlıqla yanaşıb. Təbiəti çox sevir. Kənddə meyvə bağı vardı. O ağaclara qulluq etməkdən zövq alırdı. Hər il bəlkə də həmin bağdan 1 tona qədər alma dərilirdi. Onun 1 kq-nı da satmazdılar. Zəhmətlə ev tikdirmiş, bağ salmışdı.

Ramazan müəllimin atası ona gözəl tərbiyə vermişdi. Bunun nəticəsi idi ki, o da atası kimi ailə başçısı oldu. Həyat yoldaşı Qüdrət xanımla 7 övlad: 2 oğul və 5 qız böyüdüb. Oğlu Qarayev Elşad idman müəllimi, qızları Mümkünat Heydər Əliyev adına Bakı Dərin Özüllər Zavodunda, Nazənim 7 №-li tam orta məktəbdə psixoloq, Sayad ibtidai sinif müəllimi, Hürü geoloq, oğlu Elşən isə Səngəçal Terminalında işləyir.

Elşad Qarayevin göstərdiyi qəhrəmanlıqların sayı-hesabı yox idi. Laçın, Şuşa, Ağdam, Ağdərə uğrunda gedən döyüşlərdə fəal iştirak edib. Onun göstərdiyi qəhrəmanlıq ən çox Laçın rayonunun Hoçaz dağında gedən döyüşdə olub.

Oğlunun vaxtsız, faciəli surətdə həlak olması Ramazan müəllimə, onun ailəsinə ağır zərbə oldu. Elşad öz qəhrəmanlığı, qoçaqlığı, mərdliyi, vətənpərvərliyi ilə seçilib. Ramazan müəllim fəxr edir ki, Elşad kimi oğul böyü-

düb. Vətənə əsl qəhrəman kimi qulluq edib. Onun qəhrəmanlığı ailəsinə təsəllidir. Elşadın döyüş yolundakı igidliyi hamımızın baş ucalığıdır.

Ramazan müəllim çox təmkinli, səbirli və dözümlü adamdır. Övladlarından oğlu Qarayev Elşadın, qızı Qarayeva Müşkülatın vaxtsız ölümü, həyatdan tez getmələri bir valideyn kimi onun da qəlbini parçalayır. Bütün bu dərdlərdən üstün vətən dərdidir. Yaşadığı, zəhmət çəkdiyi evə-eşiyə, girov qalan ata-babalarının qəbirlərinə, torpaqlarımıza qayıtmaq arzusu ilə yaşayır. Necə ki, kənddə 4 qardaş – Qarayev Ramazan, Oruc, Misir, Rəhim bir-birlərilə mehriban qonşu idilər, yenə Allahdan həmin mehribançılığı gənc nəsillərə arzulayır. Sizə Laçına tezliklə qayıtmağı, həmişə başımızın üstündə olmağınızı arzulayırıq.



Qayğıkeş bir ata, gözəl insan, savadlı müəllim olduğunuza görə qarşınızda baş əyir və minnətdarlığımı bildirirəm.

**Sayad QARAYEVA,**
***Laçın rayon 7 №-li tam orta məktəbin ibtidai sinif müəllimi***

**<u>ŞƏHİDLƏRİMİZ</u>**



## ARZULAR DALINCA QAÇA BİLMƏRƏM

Onda 1990-cı il idi. Onda SSRİ deyilən bir məmləkətin vətəndaşları idik hamımız. Öz əsgərinə, öz vətəndaşına güllə atan bir ölkədə yaşamağa məhkum idik o zaman. Qanlı Yanvarın dəhşətini yaşatmışdı bizə “Vətən” adlandırdığımız Sovetlər birliyi. Azadlıq mücahidlərinin səsini batırmaq üçün doğma Bakımızı al rəngə bələmişdi o gecə. Tankların, BTR-lərin tırtılları altında qalan igid oğulların, ərgən qızların, hətta körpə uşaqların və nənə-babaların da müstəqillik harayı müqəddəs sandığımız Vətən torpağına gömülmüşdü o gecə. Onda 1990-cı il idi.

O qanlı gecənin dəhşətinə sinə gərən soydaşlarımız imperiyanın caynağından birdəfəlik qurtulmaq üçün əliyalın tankların üstünə yeridilər. Ölümün üzünə dik baxdılar, təki, Vətən yaşasın, təki, harayımızı bütün dünyaya çatdıra bilək, təki Azərbaycanımızın azad və müstəqilliyini özünə qaytara bilək. Axı “qırx il kölə kimi yaşamaqdansa, bir gün azad yaşamaq yaxşıdı”, – deyiblər.

Onda 1990-cı il idi. İmperiya vətəndaşları bir-birinə güllə atırdı. Dədə yurdumuz Qarabağı da müharibə alovu bürümüşdü. Torpaq iddiasına düşən erməni quldurları soydaşlarımız yaşayan kəndlərə soxulmaqla əhalini yurdundan didərgin salmağa çalışır, havadarlarına arxalanaraq getdikcə azğınlaşırdılar. Qeyrətli vətənpərvər soydaşımız Əfqan Xanış oğlunun Sovet Ordusu sıralarından dönüşü də məhz bu günlərə təsadüf etdi.

Sovet ordusundan tərxis olunan Əfqan doğma Laçına qayıtdı. İlk gündən silaha sarılaraq, qardaşları ilə birlikdə kəndlərinin keşiyində durdu. “Qız qəbri” istiqamətindən gözlənilən təhlükələrin qarşısında əzmkarlıq, şücaət göstərdi. Xidməti maşını ilə silah-sursatın lazımi nöqtələrə çatdırılmasında köməyini əsirgəmədi. Qarlı, şaxtalı kənd yollarında gecəsi, gündüzü olmadı Əfqanın. Gah silah dalınca qaçdı, gah da soyuq səngərlərdə düşmənin başına od ələdi.

Güləbird bölüyündə döyüşən cəsur, qorxmaz oğulların sayəsində bir neçə yüksəklik düşməndən geri alınmışdı. Malxələf əməliyyatı baş tutacağı təqdirdə böyük bir ərazi də əsgərlərimizin tabeliyinə keçəcəkdi. Hər kəs Əfqanı gözləyirdi, həmişəki kimi yenə də silah dalınca o getmişdi. Hücum əmri isə silahın çatdırılacağı vaxtla üst-üstə düşürdü. Və birdən... və birdən qatı duman yarıldı... Əfqan özünü lap vaxtında yetirdi. Silah-sursat da gözlənildiyindən artıq idi... Artıq ilk güllə səsi dərədə əks-səda verdi.

Strateji əhəmiyyətli Qızartı yüksəkliyi düşmən əlinə keçdiyi üçün ordumuz ətraf ərazilərə nəzarəti qismən itirmişdi. Ona görə də bu yüksəklik daxil olmaqla, bir neçə kəndi azad etmək üçün yeni əməliyyat planı hazırlandı. Əfqanın, eləcə də döyüş yoldaşlarının əhvali-ruhiyyəsi əməliyyatın uğurlu olacağından xəbər verirdi. Baxmayaraq ki, quldur dəstələri Qızartı yüksəkliyinin əsas hissəsini minalamışdılar.

Laçın şəhəri daxil olmaqla Laçın dəhlizi də quldur nəzarətində idi. Ona görə də düşmənin ağır hərbi texnikası dəhliz vasitəsilə asanlıqla Qarabağa daşınırdı. Bu daşınmaların qarşısını almaq üçün Əfqan başda olmaqla, Güləbird bölüyü bütün qüvvələrini səfərbər edərək “Koridor əməliyyatı”na başladı. Müxtəlif və gözlənilməz cinahlardan hücuma keçən döyüşçülərimiz düşmən qüvvələrinə sarsıdıcı zərbə vuraraq geri çəkilməyə məcbur etdi.

Ağır itkiyə məruz qalan quldurlar canlı qüvvə ilə yanaşı, xeyli silah-sursat da itirdilər. Ancaq bütün bu irəliləyişlərə baxmayaraq, gözlənilən kömək vaxtında gəlib çıxmadı.

Güləbird bölüyü uzun zaman düşmənə sinə gərdi. Qubadlının işğalından sonra isə Sarı Aşıq nəvalı Güləbird də qəsbkarların caynağına keçdi. O zaman Ağdam, Füzuli istiqamətində də güclü döyüşlər gedirdi. Doğma yurddan didərgin düşən Güləbird bölüyü məhz həmin bölgədən düşmən üzərinə yeriməyə qərar verdi. Silahdaşları arasında cəsarəti ilə seçilən Əfqan həmişə olduğu kimi yenə də öndə idi. Ağır döyüşlər zamanı qismən üstünlük qazanan bölük, bir qədər də irəliləyərək Horadiz qəsəbəsində tam nəzarəti ələ keçirdi.

Arazboyu ərazilərdə döyüşlər daha da şiddətlənmişdi. Artıq Əfqan Laçın polisinin tərkibində döyüşürdü. Cəbrayılın Cocuq Mərcanlı kəndi uğrunda ölüm-dirim savaşı gedirdi. Vəziyyətin gərginliyini nəzərə alan komandanlıq Laçın polis bölüyünü döyüşə qatdı. Əfqan yenə də öndə idi. Ancaq təəssüf ki, bu döyüş qeyrətli soydaşımız Əfqanın ömrünə nöqtə qoydu.

Cəmi üç il idi ki, ailə qurmuşdu Əfqan. İki körpə balasının-Turalın və Türkanın nə doyunca üzünü görmüşdü, nə də ata nəvazişi göstərmişdi onlara. Heç ciyərparası Kəmalə xanımın bir stəkan çayını da içməmişdi əməlli-başlı. “Sevgi dolu günlər hələ qabaqdadır, vətənin bu dar günündə arzularımızın dalınca qaça bilərəm”, – demişdi Əfqan. Həmin gün nədənsə Kəmalə xanımın gözləri yaşarmışdı və bəlkə də ilk dəfə olaraq o, göz yaşlarından ürpənmişdi...



Qeyrətli vətənpərvər soydaşımız Əfqan Xanış oğlu Qorçiyev torpaqlarımızın bütövlüyü uğrunda ən ali məqama – şəhidliyə ucaldı. O, qorxmazlığı, rəşadəti ilə qəhrəmanlıq tariximizin yeni səhifəsini yazdı. Allah rəhmət eləsin!

**Ötərxan ELTAC**

**İDMANÇILARIMIZ**

## BAŞ MƏŞQÇİ ADİL ŞÜKÜROV




Şükürov Adil Teymur oğlu 16 avqust 1977-ci ildə Laçın rayonunda anadan olmuşdur. Ailəsi Bakıya köçdüyündən 1984-cü ildə Bakı şəhərində birinci sinfə getmişdir. 1985-ci ildən "Neftçi" futbol cəmiyyətində ilk dəfə olaraq Ruslan Abdullayevin rəhbərliyi altında futbolun sirlərinə yiyələnməyə başlamışdır. 1987-ci ildə Ruslan müəllim Əlcəzair milli komandasını çalışdırmağa getdiyindən, Adili özündən bir il böyük yaş qrupuna – Pankratov Valeri Pavloviçin rəhbərlik etdiyi "Neftçi" cəmiyyətinin digər komandasına məsləhət görür. Özündən bir yaş böyük uşaqlarla oynamağına baxmayaraq, əsas heyətdə möhkəmlənməyi bacarmış və bu komanda ilə iki il ardıcıl olaraq Bakı şəhər birinciliyinin qalibi olmuşdur. 1989-cu ildə məşqçisi Valeri Pavloviç Moskva şəhərinin Penza rayonunun futbol akademiyasına idman direktoru getdiyinə görə, Adilin Həmkarlar İttifaqı komandasının 1977-ci il təvəllüdlülərindən ibarət komandasına keçməyini məsləhət görür. Bu komandada Xlucin Vitali Stepanoviç və Zalatarov İvan Sirqeyeviçin rəhbərliyi altında bir dəfə Azərbaycan birinciliyinin ikincisi və bir dəfə də Azərbaycan kubokunun qalibi olmuşdur. 1992-ci ildən Azərbaycanın birinci heyətinin "Azal" komandasına və bir il sonra – 1993-cü ildə "Neftçi"nin əsas komandasının təlim-məşq toplanışlarına Vaqif Sadıqovun rəhbərliyi altında dəvət olunur. "Neftçi"də təlim-məşq toplanışlarında hazırlıq keçdikdən sonra həmin komanda ilə müqavilə bağlasa da, yaşının az olması səbəbindən o, "Neftçi"nin ikinci komandası olan "Zabrat" komandasının tərkibində fəaliyyətini davam etdirir. Elə həmin ildə bu komanda ilə Azərbaycan çempionu olaraq, ölkənin yüksək liqasında oynamaq imkanı qazanır. 1994-cü ildə orta məktəbi bitirir və indiki Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyasına daxil olur. Paralel olaraq məşqlərini də davam etdirir və 1995-ci ilə qədər "Zabrat" komandasında yüksək liqada oynayır. 1995-1997-ci illərdə ölkənin yüksək liqasında oynayan "Fərid" FK-da, 1997-1998-ci il mövsümündə "Şəfa" komandasında, 1998-1999-cu illərdə isə "Bakılı" komandasında oynayır. "Bakılı" komandasında oynayan zaman ölkənin 21 yaşlılardan ibarət milli komandasına dəvət alır. 1999-2001-ci illərdə "Kəpəz" FK ilə Azərbaycan çempionatının gümüş medalını qazanır və ölkə kubokunun qalibi olur. 2001-2002-ci il mövsümündə "Xəzər Universiteti" komandasında, 2002-2003-cü il çempionatında yenidən "Bakılı" komandasında ölkə kubokunun

yarımfinalına qədər irəliləyir. 2003-2005-ci il çempionatında "Şəfa" klubu ilə ölkə çempionatının bürünc medalını qazanır. 2005-2006-cı il mövsümündə Cənubi Azərbaycanın "Traktorsazi" komandasında oynayaraq İran çempionatında iştirak edən komandalar arasında 4-cü yeri qazanırlar. 2006-2007-ci il çempionatında "Karvan" komandası ilə Azərbaycanda ilk dəfə olaraq UEFA kubokunda mərhələ adlayır. 2007-2008-ci il mövsümündə Sumqayıt şəhərinin "Gənclərbirliyi" klubunda futbolçu kimi çıxış etdiyi son komandası olur.

2008-ci ildən isə məşqçilik karyerasına başlayır. Elə həmin il AFFA-nın təşkil etdiyi məşqçilik kurslarına qatılır və bu kursu fərqlənmə ilə bitirir. Azərbaycanın 15 yaşlılardan ibarət milli komandasında alman mütəxəssis Oliver Pelserin yanında köməkçi məşqçi kimi fəaliyyətini davam etdirir. 2009-2010-cu illərdə Oliver Pelserlə birlikdə Azərbaycanın 17 yaşlılardan ibarət komandasında yenidən köməkçi məşqçi kimi işləyir. 2010-2011-ci illərdə isə Azərbaycanın 17 yaşlılardan ibarət milli komandasında baş məşqçi kimi işini davam etdirir. 2011-2012-ci ildən "Bakı" FK-nun 14 yaşlılardan ibarət komandası ilə bürünc, 2012-2013-cü il çempionatında isə baş məşqçi kimi "Bakı" FK-nun 15 yaşlılardan ibarət komandası ilə ölkə çempionatının gümüş medalını qazanır. 2013-2014-cü il mövsümündə isə "Bakı" FK-nın 17 yaşlılardan ibarət komandasında baş məşqçi kimi ölkə çempionu və ölkə kubokunun qalibi adlarını qazanır. Bundan sonra əldə etdiyi bütün bu nailiyyətləri nəzərə alaraq, klub rəhbərliyi Adil Şükürovun ən yüksək məşqçilik kateqoriyası olan "UEFA PRO" kursuna qatılmağını məsləhət görür. Bu kurs çərçivəsində Adil Türkiyənin nəhəng klublarından olan "Fənərbaxça" komandasının uşaq futbolunun strukturunu öyrənir. "BJK"-nın "A" komandasında Slaven Biliçin yanında bir həftə təcrübə keçir. Həmyerlimiz indi və ölkə kubokunun qalibi kimi fəaliyyətini davam etdirir.

Yolun açıq olsun, Adil, sənə uğurlar diləyirik!

***

1991-ci ilin sonlarında Adilin əmisi Pənah Şükürov Laçında özünümüdafiə batalyonuna daxil olur. 1992-ci ildə Laçının işğalından sonra Pənah Şükürov bir topçu kimi ordumuzun Ağdam istiqamətindəki mövqelərində əməliyyatlarda iştirak edir və avqust ayının 17-də Gülablı ətrafında gedən ağır döyüşlərin birində həlak olur. Bu itki ailəni çox sarsıdır. 42 yaşlı Teymur (Adilin atası) işlədyi Bakı Baş Tikinti İdarəsində işini dayandıraraq ordu sıralarına qoşulur və cəbhənin Füzuli istiqamətindəki mövqelərinə gedir. 1993-cü il dekabr ayının 10-da qızğın döyüşlərdən birində düşmən gülləsinə tuş gəlir... Hər iki qardaş and, qürur və şərəf ünvanımız Şəhidlər xiyabanında dəfn olunmuşlar. Allah rəhmət eləsin! Qəbirləri nurla dolsun!

**Ramil CƏBRAYIL**

**POEZİYA**

**Dilafət HÜMBƏTOV**



## NƏ DÜNYADA GÖZƏLDİR

Biri mənə sual verdi, soruşdu:
-Şair, səncə nə dünyada gözəldir?
Mən deyirəm yaxşı saxla yadında,
Soruşsalar de dünya da gözəldir.

Dünya malı kimin olar bilinməz,
Kimin varı kimə qalar bilinməz.
Birdən gedər, birdən gələr bilinməz,
Qazancını ye dünyada, gözəldir.

Gözəl qamət, gözəl surət, gözəl bəxt,
Gözəl əmək, gözəl qazanc, gözəl taxt.
Gözəl vicdan, gözəl ad-san, gözəl vaxt,
Cəm olursa bu dünyada, gözəldir.

Sidq ürəklə orucu tut, namaz qıl,
İnsanlıqla insanlara dayaq ol.
Ölüm haqdı, ölməyən şeytandı bil,
Düz əməllə o dünya da gözəldir.

Dilafətəm, günüm yaxşı gün olsa,
Qüssə səndən, kədər səndən gen olsa.
Yar-yoldaşın sənin ilə tən olsa,
Yaşamağa bu dünya da gözəldir.

***09.06.2007***



## ÇAL AY AŞIQ, “DİLQƏMİ” ÇAL

Aşıq qardaş dinlə məni,
Dərdlərimi bil qəmi çal.
Ağlasam acizdir demə,
Göz yaşımı sil qəmi çal.
Çal ay aşıq, “Dilqəmi” çal.

Ağla bəxti yatan mərdə,
Zimistandı göydə, yerdə.
Köklə sazı pərdə-pərdə,
Bəm qəmi çal, zil qəmi çal.
Çal ay aşıq, “Dilqəmi” çal.

Fikri sözümdə olan var,
Gözü gözümdə olan var.
Odu sinəmə dolan var,
Al sazını gəl qəmi çal.
Çal ay aşıq, “Dilqəmi” çal.

Yurd-yuvamız əldən getdi,
Çəkirik nə müsibədi.
Təbriz, Bakıya həsrətdi,
Araz axır lil qəmi çal.
Çal ay aşıq, “Dilqəmi” çal.

Göyçəm, Dərbəndim, Borçalım,
Sizsiz pərişandır halım.
Qarabağsız necə qalım,
Qan ağlayır dil qəmi çal.
Çal ay aşıq, “Dilqəmi” çal.

İmansız dini neylərəm,
Rusuz bədəni neylərəm.
Vətənsiz günü neylərəm,
Həsrət oldu il qəmi çal.
Çal ay aşıq, “Dilqəmi” çal.

Balasını itirən var,
Yar yasını götürən var.
Yurddan miras gətirən var,
Didərgindir el qəmi çal.
Çal ay aşıq, “Dilqəmi” çal.

Çöllər küskün, çəmən xəstə,
Bülbül yatır dar qəfəsdə.
Xonça-xonça, dəstə-dəstə,
Xar alıbdı gül qəmi çal.
Çal ay aşıq, “Dilqəmi” çal.

Yurdu viran el görəcək,
Gülər gözdə sel görəcək.
Xar qoynunda gül görəcək,
Həsrətli bülbül qəmi çal.
Çal ay aşıq, “Dilqəmi” çal.

Sərvi qamət bükdüyümü,
Qəm qoşub dərd çəkdiyimi.
Mənim nələr çəkdiyimi,
Çəkə bilməz fil qəmi çal.
Çal ay aşıq, “Dilqəmi” çal.

Məhəbbətin girdabında,
Saysızdı Məcnun adında.
Çox aşiqlər eşq odunda,
Yanıb oldu kül qəmi çal.
Çal ay aşıq, “Dilqəmi” çal.

Dilafətin nisgilini,
Qürbətdə keçən ilini.
Yığmamış dərd-qəm əhlini,
Bacarırsan böl qəmi çal.
Çal ay aşıq, “Dilqəmi” çal.

## YURDA SALAM VERGİNƏN

*Bu şeiri Kəlbəcərə, Laçına kəşfiyyata gedən
igid vətən oğullarına xitabən yazmışam.*

Əsir qalmış vətənə gedən ay vətən oğlu,
Təmənna eyləyirəm yurda salam verginən.
Çıxarma yaddaşından sənə dediklərimi,
Mənzilinə yetişib orda salam verginən.

Suyundan dəstəmaz al, daşını möhür eylə,
Al könlünü dağların, məhəbbət mehir eylə.
Torpağı qucaqla yat, gecəni səhər eylə,
Günəşlə birgə qalxıb, bir də salam verginən.

Didərginlər gözüylə doyunca bax yurdlara,
Çiçəyindən, suyundan dərman gətir dərdlərə.

Satqınlar yurdumuzu verdilər namərdlərə,
Vətən qeyrəti çəkən mərdə salam verginən.

Danış, qoy dağlar bilsin günahkarın suçunu,
Denən el bir gün çəkib gələcəkdir köçünü.
Bax Murovdan, Murğuzdan, Kəlbəcəri, Laçını,
Əsir məzarlıqları gör də, salam verginən.

Zirvədəki qartala, səmadakı tərlana,
Dağ döşündə marala, düzlərdəki ceyrana.
Sərt qayada pələngə, meşələrdə aslana,
Yaylaqlarda ulayan qurda salam verginən.

Əyri qardan qar gətir, buzxanadan qır buzu,
Qoxlaginən nərgizi, bənövşəni, novruzu.
Qantəpəri, zirəni, qırxbuğumu, yarpızı,
Çəmənlərdən həvəslə dər də, salam verginən.

Dilafətəm, xoş günlər talan oldu, nə oldu,
İzdihamla cah-cəlal yalan oldu, nə oldu.
Get el gəlsin dalınca, olan oldu, nə oldu,
El dərdin mərd qarşıla, dərdə salam verginən.

**ARAŞDIRMA**

## II DÜNYA MÜHARİBƏSİNDƏ İTKİN DÜŞƏN PİÇƏNİSLİLƏR…
***(siyahı tam deyil)***

**Muradov Əsgər Dadaş oğlu** 1917-ci ildə Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. 1943-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Muradov Rəfi Dadaş oğlu** 1920-ci ildə Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Muradov Mirzə Məmməd oğlu** 1916-cı ildə Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. 1942-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər 1943-cü ildə itkin düşmüşdür.

**Muradov Hacıməli Hüseyn oğlu** 1914-cü ildə Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. 1942-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər 1943-cü ildə itkin düşmüşdür.

**Muradov Qasım Məmmədhüseyn oğlu** 1920-ci ildə Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Nəcəfov Dərya Allahverdi oğlu** 1916-cı ildə Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər 1941-ci ildə itkin düşmüşdür.

**Nəcəfov Tinyar Yəhya oğlu** 1916-cı ildə Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər 1941-ci ildə itkin düşmüşdür.

**Quliyev Həsənqulu Həsən oğlu** Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. 1943-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Quliyev Həsən Cəfərqulu oğlu** 1903-cü ildə Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. 1943-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Quliyev Bəhram Nəriman oğlu** 1914-cü ildə Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Quliyev Əli Nəriman oğlu** 1913-cü ildə Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. 1944-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Quliyev Əbülfət Hüseyn oğlu** 1916-cı ildə Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Quliyev Sədrəddin İbadulla oğlu** 1910-cu ildə Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. 1943-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Quliyev Qulu Hüseyn oğlu** 1912-ci ildə Laçın rayonunun Piçənis kəndində doğulmuşdur. 1943-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Mənbə:**

• Azərbaycan Respublikası Xatirə Kitabı, III cild, Q hərfi, Bakı, 2001
• Azərbaycan Respublikası Xatirə Kitabı, XI cild, M, N hərfi, Bakı, 2011

**Hazırladı: Araz YAQUBOĞLU**

**NƏSR**

**Orxan CƏBRAYIL**



## VƏDƏ YERİ…

***Laçın həsrəti ilə dünyadan köçənlərə ithaf olunur.***

Telefonuna gələn zəngin cingiltili səsinə oyandı. "Kim olar gecənin bu vaxtında", – deyə düşünməyə başladı. Narahat oldu, yuxulu-yuxulu əlini tumbanın üstünə aparıb, telefonu çətinliklə tapdı. Zəngin kimdən gəldiyini görmək üçün əli əsə-əsə telefonu gözlərinə yaxınlaşdırsa da oxuya bilmədi. Ürəyi sürətlə döyünməyə başlamışdı. Eynəyi tapmaq gec olardı, saniyələr ötdükcə telefon sanki daha bərkdən və daha təlaşla cingildəyirdi. Bu səsi susdurmaq üçün "yes" düyməsini tapmaq kifayət idi... Çətinliklə də olsa tapdı...

Telefonu qulağına aparıb:

– "Alooo" deyər-deməz

– Qağa, mənəm ee, Kamil – deyən oğlunun boğuq və təlaşlı səsi qulaqlarına doldu...

– Kamil, nooolub gecənin bu vaxtı, xeyirdimi a bala – deyərək həyacanla dilləndi.

– Qağa, Xosrov əmi...

Kamilin həyəcanlı səsi və Xosrovun adını eşitməsi ürəyinin döyüntülərini daha da artırdı.

– Ə noolub, Xosrova? – deyərək səsini qeyri-ixtiyari ucaltdı.

– Bir az əvvəl keçinib... Oturduğu yerdə...

– Nə danışırsan, a bala, nə vaxt olub, sənə kim dedi? – Axı bu gün... – deyərək sualları ard-arda yağdırdı.

Bəd xəbəri verdikdən sonra Kamilin üzərindən sanki ağır bir yük götürülmüşdü. Səsindəki boğuqluq və həyəcan kədərlə əvəzlənmişdi.

– Bizdən ayrıldıqdan sonra evə qayıdıb... Elə oturduğu yerdəcə keçinib yazıq... Mənə Tahir xəbər verdi, deyir Qaraş əmiyə denən gedirsə gəlim aparım...

– Qaraş kişi qəmgin bir səslə ancaq ki – "De gəlsin, a bala, de gəlsin..." – deyə bildi.

Ürəyində bir sızıltı hiss etdi. Dikəlib bir az yatağında oturdu, gözlərini otağın qaranlığına zilləyərək bir müddət beləcə oturaqlı qaldı. Özünü çox

yorğun və əzgin hiss etsə də, çətinliklə ayağa qalxıb paltarlarını geyindi. Ağır-ağır addımlayaraq qapıya yaxınlaşıb işığı yandırdı. Bir anlıq başı gicəllənib, gözləri alacalananda düşündü ki, yəqin yenə qan təzyiqi qalxıb. Özünü toplayıb dolaba yaxınlaşdı. Qan təzyiqinin qalxdığından əmin olmasa da, siyirməni çəkib dərmanların içindən 1 həb götürdü, ağzına qoyub udduqdan sonra üstündən su içməli olduğunun fərqinə vardı. Mətbəxə getmək lazım idi... 2 il öncə vəfat etmiş həyat yoldaşı Sənəm arvadı xatırlayıb ürəyində "Mən ölmədən niyə öldün, ay namərd", – deyərək, şikayətləndi. Ayaqlarını sürüyə-sürüyə dar, uzun dəhlizdən keçib mətbəxə girdi. Masaya yaxınlaşıb titrəyən əlləri ilə qrafini götürüb dünyanın yükünü boşaldırmış kimi, suyu stəkana süzdü. Sudan iki qurtum içib dərindən köks ötürdü...

Xosrovu düşünürdü, onun yoxluğuna inanmaq istəmirdi. İllər öncə Həsən öləndə Xosrovla bir-birinə sarılıb için-için ağladıqları anı xatırladı. İşə bir bax, illər sonra bu gün Ağcabədidə Həsənin oğlunun toyunda görüşmüşdülər. Oturub xeyli dərdləşib, ötən günləri xatırlamışdılar. Ətraflarına yığılan adamlara cavanlıqda başlarına gələn baməzə əhvalatları danışıb xeyli gülmüşdülər. Sonra qol qaldırıb cavanlıqlarında toylarda üçlükdə oynadıqları "Ruhani" havasına oynayarkən Həsənin yoxluğuna qəhərlənərək bir-birinə sarılıb için-için ağlamışdılar. Bir-birindən çoxdandır görmədikləri yaşdaşlarını xəbər almışdılar. Hamısı ölmüşdü, qalan bir Qaraş, bir də Xosrov idi...

Əlini cibinə salıb siqaret çıxartmaq istəyəndə, 3 il öncə infarkt keçirəndən sonra tərgitdiyini xatırladı. Qeyri-ixtiyari olaraq əlini ürəyinə tərəf aparıb sinəsini ovuşdurdu və siqaret çəkmək istəyini beynindən qovmağa çalışdı. Gözlərini pəncərədən boylanan mehtaba zilləyib dərin bir xəyala daldı. Bulanıq gözlərindən axan iki damla yaş, sanki xəyalları ilə qovuşaraq yanağına illərin iz saldığı qırışlarla zamanın süzgəcindən keçib keçmişə süzülürdü...

Üç dost idilər...

Qaraş, Həsən və Xosrov...

Dostluğun nə olduğunu anlamayacaqları yaşlarından, məktəbə qədəm qoyduqları ilk gündən dostlaşmışdılar. Öz kəndlərində məktəb olmadığı üçün hər gün sübh tezdən öncədən təyin etdikləri və heç zaman dəyişmədikləri vədə yerində, kəndin çıxacağındakı körpünün üstündə görüşər və oradan qonşu kəndə məktəbə gedərdilər. İllər illərə calanıb zaman ötsə də, onlar bu adətlərinə sadiq qalmış, harasa səfər edərdilərsə körpünün üstündə görüşər, sonra yollarına davam edərdilər. Son dəfə 23 il öncə yurdlarının viran qaldığı gün, doğma kəndlərini tərk edərkən vədə yerində görüşmüş və çox uzun

bir yola çıxmışdılar... Sonradan yolları ayrılmış, Qaraş Bakıya, Həsən Ağcabədiyə, Xosrov isə Şəkiyə pənah aparmışdı.

Tahirin maşını dar aralıqdan keçib, yataqxananın qarşısında dayandı. Maşının işığı aldığı xəbərin sarsıntısından evdə qərar tuta bilməyib yataqxananın həyətində o baş-bu baş gəzişən Qaraş kişinin gözlərini qamaşdırdı. Maşına oturar-oturmaz Qaraş kişi təəssüf dolu kədərli baxışlarla Tahirə baxıb nə isə demək istədi, ancaq heç nə demədən qəhərlənib sükuta qərq oldu...

Maşın yataqxananın həyətindən çıxıb yola düzələr-düzəlməz Tahir:

– Allah rəhmət eləsin, yaxşı adam idi Surxay kişi. Bir xəstəliyi yoxuydu, ay əmi?" – deyərək səssizliyi pozdu...

– Yox, ay Tahir, heç xəstəhal görsənmirdi, xeyli gümrah idi. Biz elə bu gün bir süfrə arxasında oturmuşduq. Nə biləydim bu son görüş olacaq.

Tahir dərindən köks ötürərək:

– Ehh, fələyin oyunundan heç şeytan da baş açmır, ay əmi, kim nə bilir sabah nə olacaq?!

Bir qədər fikrə getdikdən sonra Qaraş kişi nəyisə xatırlamış kimi dilləndi:

– Bu gün toyda dediyi sözlər qulağımdan heç getmir, ay bala. "Ay Qaraş, Həsən yaman yuxuma girir. Boz atın belində, körpünün üstündən elə hey məni səsləyir", – dedi. Ürəyinə dammışdı yazığın, təbrik üçün çıxış eləyəndə dedi ki: "Mən yaşamaq hərisi deyiləm, amma qoy Allah mənim canımı Laçını görməmiş almasın." Qismət olmadı, ay bala...

Bakıdan Şəkiyə qədər gedəcəyi yolu yarı etmişdilər. İsmayıllını keçdikdən sonra meşənin içindən uzanan yol ilə Qəbələyə sarı hərəkət edirdilər. Maşının sürəti artdıqca geridə qalan ağaclar kimi Qaraş kişinin xəyalları da geridə, keçmişdə qalmışdı...

Uşaq vaxtı bir-birindən heç ayrılmazdılar, bir gəzər, bir oynayar, uşaqlarla davaları düşəndə bir-birinə arxa-dayaq olardılar.

Qarlı bir qış günü idi, kənd yollarını buz bağlamışdı. Qaraş, Həsən və Xosrov məktəblərinin qarşısındakı yolda buzun üstünə qar səpərək yoldaşları ilə zarafat etmək, yıxıldıqlarını görüb gülmək istəyirdilər. Bunu edərkən müəllimlərin də oradan keçmək məcburiyyətində olduğunu hesaba almayan uşaqlar ağacların ardından yoldaşlarının yıxılmasını gözləyərkən Xəlil adlı müəllimlərinin necə yıxıldığını görürlər. Utandıqlarından ağacın arxasından çıxa bilməyən dostlar müəllimin üzünə sonralar çox çətinliklə baxa bilmişdilər. Müəllim bunu bilməsə də, hətta ayağı sınmış müəllimlərini ziyarətə gedən uşaqlar içində sinifdən 3 nəfər yox idi... Bu da Qaraş, Həsən və Xosrov idi... Qeyri-ixtiyari olaraq dodağı qaçan Qaraş kişi gözündən axan yaşı

silərək, hərəsini bir diyarda yaşamağa məcbur qoyan ermәniləri, müharibəni, köçkünlüyü lənətlədi.

Artıq mənzil başına çatmışdılar. Yas evinin həyətində qələbəlik idi. Qaraş kişi maşından düşüb uzun illərdir görmədiyi, zamanın dəyişdiyi tanış üzlü doğma insanlarla dolu olan həyətə girdi. Ona dikəlmiş qəmgin baxışların əhatəsində, evdən gələn ağlaşma səsinin sədaları altında sanki dizləri ağırlığa dözməyib hər an çökəcəkmiş kimi evə doğru yeriyirdi. Birdən ağlamaqdan gözləri qıpqırmızı olmuş, başı çalmalı bir qadın hönkürərək ona yaxınlaşdı. Qaraş kişi Xosrovun bacısı Yetəri səsindən tanıdı...

– Qaraş, gəldinmi, ay qardaş? Xosrov bizi qoydu getdi, ay Qaraş, bax orada səssiz yatıbdır – dəhlizə uzadılmış xalçaya bükülü meyiti göstərdi.

– Dur, ay Xosrov, dur, ay qardaş... Dostun gəlib, ay Xosrov – deyərək meyitə cumdu. Var gücü ilə xalçaya sarılıb hönkürtü ilə ağlayıb ağı deməyə başladı.

Qardaşı ölmüş bacının ağı deməsi əzablı mənzərədir. Bu mənzərənin təsiri ilə yerində donub qalmış Qaraş kişi nə irəli gedə bilirdi, nə geriyə... O hıçqırıqla ağlayır, qan çanağına dönmüş gözlərindən axan yaşlar yanağını isladırdı. Xasiyyətcə çox zarafatcıl olan Xosrovun uşaqlıqda olduğu kimi yenə bir köşədən çıxıb, – amma səni yaman aldatdım ha, ay Qaraş, – deməsini istəyirdi. Birtəhər geri döndü və nəfəs almaq üçün özünü çölə atdı. Çöldəki insan izdihamı onu daha da boğurdu. Son 23 ildə bu qədər həmyerlisi ilə ən çox xeyir-şər məclislərində bir arada olurdu.

Dostuna son borcunu yerinə yetirib, dəfndə iştirak etdikdən sonra geri qayıdırdılar. Yol boyu Qaraş kişi bir kəlmə belə danışmadı.Yalnız maşın İsmayıllıdan keçib dağların ətəyi ilə zirvəyə qalxdıqdan sonra səssizliyini pozaraq Tahirdən maşını saxlamasını istədi. Maşından enib dərindən nəfəs alaraq hərisliklə dağ havasını ciyərlərinə çəkdi. Söhbət etməyə, içini tökməyə, bəlkə də elə sarılıb ağlamaq üçün kiməsə ehtiyacı var idi. Lakin o tənha idi... Onu anlaya biləcək, keçmişdən söhbət açacaq kimsəsi qalmamışdı... Dağ havasının ruhuna sakitçilik gətirəcəyini düşünsə də, ürəyi yerindən qopacaq kimi döyünürdü. Gözləri qarşıdakı dağların qarlı zirvəsində gəzişsə də, xəyalı keçmişin dərinliklərində dolanırdı. Kəndləri, dağlarındakı buz bulaqlar, meşələr, Laçında keçirdiyi günlər, dostlarının xəyalı gözlərinin önündən gəlib keçirdi. Bir-birindən ayrılmaz sandıqları dostları ilə keçirdiyi əvəzsiz, saf və unudulmaz uşaqlıqlarını, bir dəfə dərsə gedərkən vədə yerinə gecikdiyini və dostlarının dərsə gecikməmək üçün onu gözləməyib getmələrini və onlardan küsməsini xatırladı. Dostları bu dəfə də onu gözləməmişdilər...

Üzünü oxşayan sərin meh Qaraş kişini daldığı xəyallardan həqiqət dünyasına qaytardı. Pencəyinin sağ cibindən dəsmalı çıxardaraq göz yaşlarını sildi. Əli ilə oturmaqdan keyimiş dizlərini ovuşduraraq çətinliklə ayağa qalxıb maşına tərəf getdi. Əli ilə işarə verib:

– Gedək, ay bala, – deyib maşına əyləşdi.

Üç gün idi qayıtmışdı Bakıya. Yataqxanadan çıxıb ağır addımlarla dayanacağa tərəf yol aldı. Həmişə dəqiqələrlə gözlədiyi avtobus sanki durub onu gözləyirdi. Yerini tutdu və saatına baxdı.Vaxtında yetişmək üçün 1 saatı var idi...

Dar dəhlizdən keçib həkimin otağına daxil oldu. 10 gün öncə “bu yaşdan sonra əzrayılla dava edəsi deyiləm ki, ay həkim, əməliyyat-zad istəmirəm, 1-2 dərman yaz çıxıb gedim”, – deyərək sağollaşıb getdiyi həkimin qarşısında əyləşərək ona qərarını dəyişdiyini söylədi. Qeyri-ixtiyari olaraq bir neçə gün öncə Xosrovun dediklərini xatırladı və həkimə “Mən yaşamaq hərisi deyiləm, amma Laçını görməmiş bu dünyadan köçmək istəmirəm”, – dedi. Yaşamaq istəyirdi... Laçına, doğulduğu kəndə getmək ümidi ilə yaşamaq istəyirdi... Xosrovla Həsənin onu vədə yerində gözləməmələrinə rəğmən Laçını görmək arzusu ilə yaşamaq istəyirdi...

**OVQAT**

## MÜQƏDDƏS TORPAĞINDAN ÖPƏCƏYİM GÜNÜ GÖZLƏYİRƏM

*Xəfif yeldən titrəyən*
*yarpağına Vətən dedim.*
*Yanıq, quru,*
*göy kəklikli,*
*boz qumrulu*
*torpağına Vətən dedim.*
*Dağlarının köpük duman*
*duvağına Vətən dedim.*

***Rəsul RZA***

Dünyada ən böyük dərd torpaq, vətən dərdi imiş! – deyənlər nə qədər haqlıymış. Zaman çox yaraları sağaldır, çox dərdlərə məlhəm olur. Yurd, oba dərdi isə zaman ötdükcə daha ağrılı olur. Bu dərdin dərmanı doğma yerlərə qovuşmaqdır. Çünki Vətən içdiyimiz su, nəfəs aldığımız hava, yediyimiz çörəkdir.

**23 ildir əsirlikdə qalan dağlar gözəli Laçınım!**

Hərdən təxəyyülün gücü ilə Sənə qovuşmaq istəyirəm. Səsimi indi həsrətdən ağı deyən Ana Həkərinin zümzüməsinə qatıb barlı-bərəkətli meşələrini qarış-qarış gəzmək istəyirəm. Həsrətdən qarı əriyən dağlarının havasını ciyərimə çəkmək istəyirəm. Hər qarış torpağın üçün, daşlı-kəsəkli yolların üçün, hətta ot bitməyən sıldırım qayaların üçün burnumun ucu göynəyir. “Burnumun ucu göynəmək” ifadəsinin əslində nə olduğunu mən Laçını tərk edəndən və anamı itirəndən sonra dərk etmişəm.

Bu nisgili, kədəri ancaq sən qəlbimizdən silə bilərsən. Sinəsi dağlı ağbirçəklərini sən ovuda bilərsən. Övladlarının həsrət dolu könüllərini sən şad edə bilərsən.

Uşaqlıq illərimə, gəncliyimə qayıdıram. Daha doğrusu, uşaqlığımın, gəncliyimin vətəni olan Laçınıma qayıdıram.

Xəyalımda canlanan ilk mənzərə – başı qarlı, vüqarlı dağlar, məktəbimə aparan dar cığır, bir də 1 №-li orta məktəbim. O məktəb ki, neçə-neçə adlı-sanlı övladlar yetişdirib. Bizim üçün ömürlərini şam kimi əridən qayğıkeş müəllimlərimi xatırlayıram (həyatdan köçən çox sevdiyim Kamal müəllimə, Ulduz müəlliməyə, Maya müəlliməyə, ilk müəllimim Ruqiyyə müəlliməyə Allahdan rəhmət diləyir, həyatda olanlara cansağlığı, xoşbəxt ömür arzulayıram).

Dağların saf havasını uda-uda, şehli otların ətrini duya-duya məktəbə getmək, vətənli günlərimə qayıtmaq istəyirəm. Ən böyük arzum budur ki, 23 illik həsrətinə son qoyulsun.

Zümrüd meşəli, buz bulaqlı Laçınım! Yəqin ki, övladlarından incimisən. Fikirləşirsən ki, səni düşmən əlində qoyub qaçdılar. Əsla! Sən bir qrup xainin, xəyanətkarın güdazına getdin. Dağların, daşların qan ağlamasın! Oğulların səni düşmən əlində qoymayacaqlar. Büllur bulaqların yenə şən zümzümələr edəcək, meşələrində bülbüllər cəh-cəh vuracaq, yaylaqların qoyun-quzu səsindən oyanacaq, dağların əyilən qəddini düzəldəcəkdir. Mən bu sətirləri inamla yazıram. Ürəyimdə olan torpaq sevgisi inamımı ölməyə qoymaz. Səbirsizliklə müqəddəs torpağından öpəcəyim günü gözləyirəm. Haqq bizimlədir, zəfər də bizim olacaq!



**Zöhrə İBRAHİMOVA**

**POEZİYA**

**Elnur İRƏVANLI**



## BAYRAĞA DÖNMÜSƏN, ZİRVƏLƏŞMİSƏN

*Azərbaycan Demokratik Respublikasının qurucularından biri olan Məhəmməd Əmin Rəsulzadənin (Rəsulzadə Məhəmməd Əmin Ələkbər oğlu) anadan olmasının 130 illik yubileyi münasibətilə*

Sevinsin türk dünyası, sevinsin el-obalar,
Alovlandı könüllər, buz bağlamış sobalar.
"Haqq nazilər, üzülməz", – demiş ulu babalar.
Burda qələbə çaldı haqqın haqq olan işi,
Mübarəkdir bayramın, Məhəmməd Əmin kişi!

Azmı olub diriykən qəbirləri qazılan,
Kitab kimi oxunub, vərəq kimi cızılan,
Zamanın sinəsinə qızıl qanla yazılan?
Danmaq olmaz bircə an nə tarixi, keçmişi,
Mübarəkdir bayramın, Məhəmməd Əmin kişi!

Yer dayanıb yerində, eyləsə də köç zaman.
Ələyib ələyindən sonra deyir: seç, zaman.
Allah haqqı nahaqa verməyibdir heç zaman,
Düzünə fırlanıbdır müdam çarxın gərdişi.
Mübarəkdir bayramın, Məhəmməd Əmin kişi!

Kölgənə qılınc çalan çox idi bəddən bədin,
Qoymadı ki, sınasan inamın, qətiyyətin.
"Bir kərə yüksələn bayraq bir daha enməz!" – dedin,
Budur Vətənə xidmət, yurda sevinc gəlişi,
Mübarəkdir bayramın, Məhəmməd Əmin kişi!

Qolumuzda güc-qüvvət, damarımızda qan oldun,
Ömrə zinət verən şərəf oldun, şan oldun,
Azərbaycan ürəksə, sən də ona can oldun.
Ey yurdumun azadlıq, birlik, məslək günəşi,
Mübarəkdir bayramın, Məhəmməd Əmin kişi!

***31.01.2014***

**AXTAR BABALARI**



## QULİYEV ƏLİŞ İSMAYIL OĞLU

Əliş Quliyev 1898-ci ildə Laçın rayonunun İmanlar kəndində doğulmuş və 1997-ci il noyabr ayının 4-də 99 yaşında Ağcabədi ərazisindəki Taxtakörpü məcburi köçkün qəsəbəsində dünyasını dəyişmişdir.

Onun ömür yolu mənalı olmuşdur. Belə ki, Laçın rayonunun əksər kəndlərində o zamanlar müqəddəs və xeyirxah iş sayılan sünnət toylarında dəlləklik etmişdir.

Böyük Vətən müharibəsinin başlanmasından bir il keçdikdən sonra, müharibənin qızğın bir vaxtında, 1942-ci ilin iyun, iyul aylarında Əliş Quliyev Laçın Rayon Hərbi Komissarlığı tərəfindən səfərbər olunaraq müharibəyə göndərilmişdir. O, Sevastopol və Stalinqrad döyüşlərində 1943-cü ilin yayına kimi döyüş yolu keçmişdir. 1943-cü ilin avqustunda adı yuxarıda çəkilən ərazilərin birində faşistlərlə döyüş aparılan zaman düşmən təyyarələri sovet döyüşçülərini bombardman etmiş, yüzlərlə sovet döyüşçüsü həlak olmuşdur. Əliş Quliyev və bir neçə döyüşçü yoldaşı yaralanaraq həmin ərazidəki hospitallardan birinə aparılmışlar. Lakin hospitallarda yaralananlardan yer olmadığından onu və bir neçə başqa yaralını Özbəkistanın Səmərqənd şəhərindəki hərbi hospitala yerləşdirir, bir neçə ay orada müalicə olunduqdan sonra Özbəkistanın paytaxtı Daşkənd şəhərindəki hospitala göndərirlər. 6 ay da orada müalicə olunandan sonra yaralarının ağır olmasını nəzərə alaraq Əliş Quliyevi 1943-cü ilin axırlarında müharibədən birdəfəlik "komsavat" edib Azərbaycana göndərirlər.

Əliş Quliyev Bakıda hərbi hospitalda, Semaşko xəstəxanasında müalicə olunaraq birdəfəlik öz doğma kəndinə qayıdır.

O, yenə də öz sənətini davam etdirir, yəni sünnət toyları və aşıqlıq etməyə başlayır. Əliş Quliyev sınığı, çıxığı, diş çəkməyi də bacardığından bu kimi işləri də yerinə yetirirdi. Onu da deyim ki, o zamanlar camaatın kasıb vaxtı olduğundan bu işlərin çoxunu təmənnasız yerinə yetirərmiş. Əliş kişi həmişə Vəlibəyli kəndindən olan Aşıq Bəylərlə aşıqlığa gedərmiş. Rəhmətlik Aşıq Bəylər havacat aşığı idi. Əliş Quliyev də onun dəmkeşi olarmış. Tərəkəmə camaatının dağlara köç etdiyi yaz-yay aylarında

rəhmətliklər ikisi və nağaraçı Nəsir (o da Vəlibəyli kəndindən idi) zurna-balabanlarını diplomatlarına yığıb Dəlidağa aşıqlığa gedər, tərəkəmə toylarında çalıb-oxuyarmışlar.

Əliş Quliyevin təhsili olmadığından 1975-ci ilə kimi qocalığa görə təqaüd alırdı. 1975-ci ildə qardaşı oğlu Saday Əli oğlu onun hərbi biletini araşdıran zaman müharibədən yaralı qayıtdığı üzə çıxır. Sənədləri Laçın Rayon Hərbi Komissarlığına təqdim edir və həmin vaxtdan qocalığa görə təqaüdü Böyük Vətən müharibəsi təqaüdü ilə əvəz olunaraq 90 manata çatır.

Əliş Quliyev 1979-cu ildə İmanlar kəndindən Ağdam rayonunun şəhərə bitişik kəndi olan Seyidli kəndinə köçür. Qardaşı oğlanları yaşayan kənddə müharibə veteranı kimi ona torpaq sahəsi verilir. Orada yaxşı evlər də tikir. Ağdam Rayon Hərbi Komissarlığı tərəfindən Əliş Quliyevə 1989-cu ilin noyabrında "Zaporoje" markalı veteran maşını da təqdim olunur.

Əliş Quliyev hələ Laçında olarkən "Böyük Vətən müharibəsi" ordeni ilə təltif olunmuşdur. İstər Laçında, istərsə də Ağdamda yaşadığı müddətdə hər il 9 May Qələbə Günündə hərbi komissarlığa çağırılaraq müxtəlif hədiyyələrlə mükafatlandırılmışdır.



Dörd övladı: iki oğlu, iki qızı var. Dördü də ailəlidir. İki oğlu və bir qızı Bakı şəhərində, bir qızı isə Ağcabədi ərazisindəki Taxtakörpü qəsəbəsində məskunlaşıb.

**Vəli QULİYEV,**
***Taxtakörpü qəsəbə tam orta məktəbinin ümumtexniki və əmək təlimi müəllimi***

**ARAŞDIRMA**

## SÖZ GÜLƏŞİ VƏ YARIŞI

Əsrlərdir ki, danışığımız və yazımızın kökündə özlərinə bərk yer etmiş, ancaq maska-qılıqlarını indiyədək çıxarıb atmamış yüzlərlə sözün sinonimlərini arayıb tapmaq və yaxud yaratmağın vaxtı artıq çoxdan çatmamışdırmı? Söhbət onları dildən çıxarıb qovmaqdan deyil, dilin öz can-tənindən, ət-qanından gələn həmmənа söz və anlayışların onlarla yarışa, rəqabət apara bilməsi üçün gərəkli şərait yaradılmasından gedir. İşin məğzinə keçək və çoxlu örnəklər verək: mötərizə, mənsubiyyət, zəruriyyət, bilaixtiyar, bilavasitə, istiqlaliyyət, məhdudiyyət, məhrumiyyət, mütləqiyyət, möhtəviyyat, riyaziyyat, mütərəqqi, səlahiyyət, vəhdaniyyət, rəbbaniyyət, ədəbiyyat, qeyri-ixtiyari, qabiliyyət, qeyri-müəyyən, müqəddərat, müntəxabat, müvazinət, əhvali-ruhiyyə, mükəlləfiyyət, səbəbiyyət, xüsusiyyət, mütənasib, tərsimi-həndəsə, təbəddülat, üslubiyyat, müqəddimə, əlahiddə, mütəşəkkil, muxtariyyat, məğlubiyyət, məşğuliyyət, səmimiyyət, mütəhərrik, qeydiyyat, iqtisadiyyat, təfərrüat, fərdiyyət, kəşfiyyat, əhəmiyyət, təsərrüfat, ictimaiyyət, məhkumiyyət, mündəricat, mürəkkəb, inzibati, mükəmməl, mənəviyyat, mütəxəssis, məcburiyyət, ümumiyyət, hüsn-təvəccöh, müxəlləfat, müavinət, müəssisə, valideyn, keyfiyyət, kəmiyyət, ibtidai, əməliyyat, mülkiyyət, bəşəriyyət və s. və i.a. Bu və bu kimi sayı bilinməz ərəb sözləri doğmalaşıbmı, yoxsa min ildən artıqdır ki, dikbaş yadelli işğalçı görkəmlərini saxlamaqdadırlar? Bir şey açıq-seçik bəllidir ki, onlar dilimizin qayda-qanunlarını saya salıb onlara uymur, dilimizsə indiyədək onları sinirib özününküləşdirə bilmir. Onların yad mayası dilimizin öz mayasına qaynayıb-qarışıb yox olmur, yekcins bir kütlə əmələ gətirmirlər. Bu yad sözlərin çox-çox əvvəllərdə sinonimləri olmuş, tez-tez müstəmləkə (bu söz də onlardandır) ruhu onları dilin ən dərindəki alt qatına sürgün etmiş və yaxud yerli-dibli it-bata salmışdır. İndi haqqı dikəltməyin, bərpa etməyin vaxtı gəlməmişdirmi? Bu sualın cavabı geniş ellik sözləşmələrin (müzakirələrin) nəticəsində ortaya çıxmış ola bilər. Öz tərəfimdən bu söz taydaşlarına (sinonimlərə) aid bir neçə örnək də verə bilərəm. Ən başlıcası öncələr işlənmiş, indisə işlənişdən çıxmış (oxu: çıxarılmış), habelə çağdaş dillərdə işlədilməkdə olan belə sinonimləri yavaşlıqla canlı işlək dilə qaytarmaq, fikrimcə, artıq çoxdanın gərəkliyidir. Bu sunmalardan (təkliflərdən) bir kimilərini göstərmək istərdim: möhtəviyyat – içərilik, müqəddərat – önyazı (yeri gəlmişkən, dini anlamda işlədilən

"alın yazısı" çox əski bir tərcümə səhvinin sonucunda ortaya çıxıb: bu ifadə "alın yazısı" deyil, "önyazı" (proqram) kimi tərcümə olunmalıymış), mütəşəkkil – toparlı, məhdudiyyət – qısıtlama, əhvali-ruhiyyə – dimaq (arada işlənir), məğlubiyyət – yenilgi, müfəssəl – narınca, ictimai – qamu (hamı), keyfiyyət – necəlik, kəmiyyət – neçəlik, mürəkkəb – toplaşıq, intiqam – öc, qeyri-müəyyən – bəllisiz, mütəxəssis – özəlişçi (ixtisas – özəliş), xüsusiyyət – özəllik (işlənir), ayrıcalıq, bilavasitə – arasız, aralıqsız, bilaixtiyar – bilmədən, vəhdaniyyət – təkcəlik, rəbbaniyyət – yiyəlik, mütləqiyyət – təkağalıq və təkvarlıq, mötərizə – qabıqcıq (rusca bizim "kavıçkı" sözü işlənir), ibtidai – ilkolan, ənilk, ifrat – ənuc, səbəbiyyət – nədənlik (işlənir), müvazinət – dəngə (tarazlıq, rusca və qazaxcadakı "denqi" və "təngə" sözləri də bu sözdəndir, pul əslində dəngə, tarazlıq yaratmalıdır; tənlik – ilkində dənglik olmuşdur), mahiyyət – özlük, zəruriyyət – gərəklik, nailiyyət – qazanış, müvəffəqiyyət – uğur, çatış, təzahür – görsəniş (bəndənizin dövriyyəyə buraxdığı), əlamət – görsənti, qəssab – ətçi, təsərrüfat – eveşikçilik, əhəmiyyət – önəm (işlənməkdədir), mütərəqqi – irəlicil, daha düzü, irəlicil), muxtariyyat – özqurumlu (özqurullu), hürriyyət – özdənlik, mübtəda – kimnəlik və yaxud öznəlik, təvazökarlıq – könlüsayalıq, iştirak – qatılış, mütəfəkkir – düşünər və s. və i.a. Bu qonunu hələ çox davam etdirmək olar. Məncə, ilk yazı üçün bu qədər yetər. Ən əsası onun nə dərəcədə aktual olması və oxucuların bu məsələyə necə yanaşacaqlarıdır. Necə deyərlər, yaşayıb görərik. Mövzu ilə bağlı hər cür fikir və rəy mənimçün çox maraqlıdır. Bircə susqunluq, biganəlik olmasın.



Hər kəsə ən yey diləklərlə.

**Yusif OTAYLI**

## "FİKİRLƏRİMƏ QARŞI MÜHARİBƏ ELAN ET"

"Əziz qızım,

İndi gecədir. Yeni il gecəsi. Mənim balaca qəsrimin silahsız mühafizəçiləri yatırlar. Bacın və qardaşın yatıb, hətta anan da yuxulayıb. Bu yarıqaranlıq otağa gəlincə az qaldım hamısını oyadam.

Necə də uzaqsan məndən! Əgər indi şəkillərinə baxmıramsa, kor olum. Şəkillərin masamın üstündə, ürəyimə ən yaxın yerdə dayanıb. Amma sən haradasan? Uzaqda, nağıllar şəhəri Parisdə, gözəl bir səhnədə rəqs edirsən. Bu sakit gecənin səssizliyində sənin ayaq səslərini açıq-aydın eşidirəm. Gözlərin gözlərimin qarşısına gəlir; gözlərin qış gecəsində bərq vuran ulduzlar kimidir. Bu gözəl tamaşada şahın əsir götürdüyü gözəllər gözəli o fars qızını oynadığını bilirəm. Gözəllər gözəli ol, rəqs elə, ulduz ol və parıltın aləmə yayılsın. Amma tamaşaçıları məftun etməkdən sərxoş olanda, sənə verilən çiçəklərin qoxusu başını gicəlləndirəndə bir küncə çəkilib məktubumu oxu, atanın sözlərinə qulaq ver.



Mən sənin atanam, Ceraldin! Mən Çarliyəm, Çarli Çaplin! Kaş biləydin, neçə gecə beşiyinin başında oturmuşam, şirin nağıllar danışmışam. Bəzən "Yatmış gözəl"i, bəzən "Pis qəlbli əjdaha"nı nağıl etmişəm... Yuxu gəlib qoca gözlərimi bağlamaq istəyəndə onu ələ salır və deyirdim: "Rədd ol! Mənim yuxum – qızımın xəyallarıdır!". Mən sənin xəyallarını görürdüm, Ceraldin! Sənin gələcəyini görürdüm, bax bu gününü! Səhnədə rəqs edən qızı görürdüm, qanadlarını açıb havada uçan pərini... İnsanların sözlərini eşidirdim: "Bu qızı görürsən? Qoca bir klounun qızıdır. Atasının adı Çarli idi, yadına gəlmir?". Rəqs və alqış səsləri ayaqlarını yerdən kəsəcək. Qanadlan və uç yüksəkliklərə! Amma arada ayaqların yerə dəysin. Xalqın necə yaşadığını bilməlisən, küçə rəqqaslarının həyatı ilə tanış olmalısan. Aclıqdan rəngi solan, yoxsulluqdan və soyuqdan titrəyə-titrəyə rəqs edənlərlə...

Mən də onlar kimi olmuşam, Ceraldin! O sehrli gecələrdə, sən mənim nağıllarımda yatırdın, amma mən yatmazdım. Sənin gözəl simana baxar, ürəyinin döyüntüsünə qulaq asar və öz-özümdən soruşuram: "Çarli, görəsən, bir gün bu balaca quş səni başa düşəcək? Sən məni tanımırsan, Ceraldin, mənim nağılım çox qəribədir. Yoxsul bir klounun nağılıdır bu. Londonun kənar məhəlləsində mahnı oxuyub rəqs edən, sonra bəxşiş yığan klounun nağılıdır. Mənim nağılımdır!

Mən aclığa da yaxşı bələdəm, evsizliyə də. Bu nədir ki? Mənim okean böyüklüyündə qürurla qabaran sinəmdə qabağıma atılan qəpiklərin sızıltısını hiss etmişəm, hamının yazığı gələn, alçaldılan səfilin nə çəkdiyini bilmişəm. Hər şeyə rəğmən, həyat davam edir. Yaşayanlar haqda həmişə daha az danışılır. Sən mənim soyadımı daşıyırsan, Çaplini...

Bu ad yarım əsrdən çox bütün dünyanı güldürüb; mənim ağlamalarımın yanında bu gülmələr nədir ki? Sənin dünyan ancaq rəqs və musiqidən ibarətdir... Ceraldin, bir gecə yarısı o məşhur səhnədən düşəndə varlı tamaşaçılarını unut, amma mindiyin taksinin sürücüsündən arvadının hal-əhvalını soruşmağı unutma. Bəlkə arvadı hamilədir, bəlkə doğulacaq ilk uşağı üçün paltar almağa pulu yoxdur heç... Əgər belədirsə, onun cibinə pul qoy. Kredit Bankına tapşırmışam, bütün ehtiyaclarını qarşılayacaqlar. Arada metroya, avtobusa min, şəhəri gəz. İnsanlara bax, yaxşı müşahidə elə onları...Dul və yetimlərin gözlərinə yaxşı bax. Heç olmasa gündə bir dəfə özünə de: "Mən də onlardan biriyəm!". Bəli, əziz qızım, unutma, sən də onlardansan...



Sənət göyə uçmaq üçün adama qanad taxana qədər onun dabanlarını çürüdür. Bir gün tamaşaçı qabağında yüksəldiyini hiss etsən, səhnədən düş, çıx küçəyə... Bir taksi tut, get Parisin kənar küçələrinə... Elə yaxşı tanıyıram oraları. Orada rəqqasələr görəcəksən; aralarında sənə oxşayanı da var, səndən daha arıq, daha qürurluları da... Teatrdakı parlaq səhnə işıqları orada yoxdur. Onların səhnə işıqları Aydır. Bax onlara, diqqətlə bax! Səndən də yaxşı rəqs edirlər, elədirmi? Etiraf elə bunu...Səndən daha yaxşı rəqs edən, səndən daha yaxşı rol oynayan birini görsən nə vaxtsa, bu sözlərimi yadına sal: "Hələ Çarlinin ailəsindən fayton sürücüsünə pis söz deyən, ya da Sena çayının sahilində dilənən birini ələ salan insan çıxmayıb". Çarli bu dünyadan gedəcək, Ceraldin! Sənin həyatın isə davam edəcək. Heç vaxt yoxsulluğu görməyini istəmirəm.

Bu məktubla birlikdə sənə çek də göndərirəm. Nə qədər istəyirsən xərclə. Amma yadda saxla: iki frank özün xərcləyəndə, üçüncü frankı başqasına xərclə. Üçüncü frank sənin deyil, tanımadığın, görmədiyin, bir frankın həsrəti ilə yaşayanındır. O insanı tapmaq çətin deyil. Hər küncdə yoxsul adamlar görə bilərsən, təki sən görmək istə! Mən bu şeytanın insanın ağlını başından necə aldığını bildiyim üçün puldan danışıram. Uzun müddət sirkdə işləmişəm, ip üstündəki kəndirbazlara qorxu ilə baxmışam. Bil ki, əziz qızım, insanın ayağının sürüşməsiylə yerə dəyməyi kəndirbazların o ipdə sürüşməyindən daha asandır. Sən bu gecə brilyantın cazibəsinə aldana, istər-istəməz yerə dəyə bilərsən. Gün gələr, bir şahzadənin üzü səni əsir alar. Bax o gündən sonra sən artıq təcrübəsiz kəndirbaz olacaqsan. İp isə həmişə təcrübəsizlərə xəyanət edir. Heç vaxt qızıl və daş-qaşlara görə ürəyini satma. Unutma ki, ən böyük brilyant günəşdir və bəxtimizdən də günəş hamımızı bərabər işıqlandırır.

İşdir, bir gün sevsən, seçdiyin insanı bütün qəlbinlə sev. İşinin çətin olduğunu bilirəm. İndi bədənini gözəl ipək parçalar bəzəyir. Sənət üçün səhnəyə çılpaq da çıxa bilərsən. Amma o səhnədən saf, təmiz və qüsursuz enməlisən. Mən qocalmışam, sözlərim sənə gülməli görünə bilər. Amma məncə, sənin çılpaq bədənin çılpaq ruhuna vurulan insana aid olmalıdır. Neyləyim, bu mövzuda bir az geri düşüncəliyəm... Bəlkə fikirlərim 10 il əvvəldə ilişib qalıb. Qorxma, Ceraldin, bu 10 il səni qocaltmaz. Mən sənin bu çılpaq adada boyun əyən ən axırıncı insan olmağını istəyirəm. Atalar və uşaqlar arasında həmişə problemlər olur. Mənə müharibə elan et, əziz qızım, fikirlərimə qarşı müharibə elan et. Mən itaətkar uşaqları sevmirəm. Bu məktubumun üstünə hələ göz yaşım düşməmiş bu Yeni il gecəsinin möcüzələr gecəsi olduğuna inanmaq istəyirəm. Bir möcüzə baş verməyini və demək istədiyim hər şeyi düz başa düşməyini istəyirəm.

Çarli qocalıb, Ceraldin, çox qocalıb. Sən gec-tez qara paltarlar geyinib məzarıma gələcəksən. İndi sənin əhvalını korlamaq istəmirəm, amma arada güzgüyə bax. Orada məni görəcəksən. Damarlarında mənim qanım axır. İstəyirəm ki, mənim damarlarımdakı qan axmaz olanda atan Çarlini unutmayasan.

Mən mələk olmamışam, amma həmişə insan olmağa çalışmışam.

Sən də elə ol.

Öpürəm səni, Ceraldin.

Sənin Çarlin.

**POEZİYA**



**Bənövşə DAŞDILI**

## DƏRDLƏŞMƏ

***Bənövşə Daşdılı***
Halımdan xəbərin oldumu, bacı? –
Anam bir şam kimi söndü bu gecə.
Fələyin verdiyi acı şərbəti
İçdim dil-dodağım yandı bu gecə!..

***Səadət Gəncəli***
Vətəndən uzaqda, vətən qoynunda
Bir ana gözünü yumdu bu gecə.
Öz doğma elinə, həsrət elinə –
Quşa dönüb ruhu qondu bu gecə!..

***Bənövşə Daşdılı***
Yeddi qardaş getdi, geri gəlmədi,
Yaşadı həsrətlə, üzü gülmədi.
Vətən həsrətinə dözə bilmədi,
Ruh olub dağlara döndü bu gecə!

***Səadət Gəncəli***
Dəyişdi dünyası gözündə həsrət,
Dəyişdi dünyası sözündə həsrət.
Özü, özü boyda özündə həsrət,
Həsrətə çevrilib dondu bu gecə.

***Bənövşə Daşdılı***
Yağı at oynadır əsir elində,
Elə vətən sözü hər an dilində.
Çox sevirdi tikanın da, gülün də –
Qibləsi Laçına çöndü bu gecə!..

***Səadət Gəncəli***
Yağı at oynadan elləri dustaq,
Çölündə, düzündə gülləri dustaq.
Yaşadı gör neçə illəri dustaq –
Bilmədi, nə bilsin sondu bu gecə...

***Bənövşə Daşdılı***
Bəlkə uçub ruhu, göydə dolanır,
Bəlkə bulaqdadır, yola boylanır?..
Öz doğma kəndinə, evə yollanır,
Sevinir, həsrətə sondu bu gecə!.

***Səadət Gəncəli***
Ruhun qoy göylərdə dolansın, ana!
Yenə bulaq üstə yollansın, ana!
Saz da dilə gəlsin, dillənsin, ana!
Yurduna qovuşan gündü bu gecə!..

***Bənövşə Daşdılı***
Anam növrağımı nə yaman pozdu,
İtirdiyim çoxdu, tapdığım azdı.
Bənövşə adını yetimtək yazdı –
Gah alışdı, gah da dondu bu gecə!.

***Səadət Gəncəli***
Səadət qarşında əyib başını,
Töküb gizli-gizli gözüm yaşını.
Vətəndə vətənsiz qəbir daşını –
Əbədi bir heykəl sandı bu gecə!..

## KÜLÜMLƏ OYNAMA NOLUR

*Bir dəfə kitabımı Axundov adına kitabxanada işləyən qadına vermək istədim. Dedi ki, şeirlərin yaman ağırdır. Oxuyanda ağlayıram. Bir dəfə oxumuşam sənin şeirini.*

*Onda özümə söz verdim ki, şeirlərimə bir az yüngüllük qatım. Yoxsa heç kim oxumaz.*

Vurmusan xəncəri, qan verir yaram,
Duz qoyub üstünə bağlama, nolur!..
Söyləmə kimsəyə diriyəm, varam –
Nə də ölü kimi ağlama, nolur...

Çox qapılar bağlananda üzümə,
Ölüm arzuladım onda özümə.
O idi qapısın açan üzümə –
Gəl onun qapısın bağlama, nolur!

Məni çox dərmansız dərdlərə saldın,
Bütün sevincimi əlimdən aldın .
Odumu söndürüb qorumu çaldın –
Sovrulan külümlə oynama, nolur!..

Vermişəm sinəmi dağlı dərdlərə,
Dözməsə Bənövşə bağlı dərdlərə.
Ölsə bu nisgilə bağlı dərdlərə –
Tez qoyub məzara bağlama, nolur!..

## ÖLMƏYƏ DƏYƏR

Gizli-gizli baxıb səni süzərsə,
Yoluna xəlvətcə güllər düzərsə.
Belə bir sevənin ələ düşərsə,
Onu Məcnun kimi sevməyə nə var –
Beləsindən ötrü ölməyə nə var?…

Gözü ürəyinin güzgüsü əhsən!..
Baxanda könlünün için görəsən –
Sevgisi təmizdir, safdır biləsən,
Belə bir gözəli sevməyə nə var,
Beləsindən ötrü ölməyə nə var?…

Görəndə gözlərin sevinə, gülə,
Könlünün dumanı, çəni çəkilə.
Üzündən Yusifin nuru tökülə,
Belə bir gözəli sevməyə nə var?!.
Vallah ondan ötrü ölməyə nə var!

Bütün hərəkəti yerində olan,
Mükəmməl biliyə, hikmətə dolan.
Hər an əzizləyib qayğına qalan –
Belə bir gözəli sevəməyə nə var...
Elə ondan ötrü ölməyə nə var!..

Dara düşən anda özün yetirsə,
Yolundan dumanı, çəni götürsə.
Ömrünə baharı, yayı gətirsə,
Bənövşə, sevinib gülməyə nə var –
Beləsindən ötrü ölməyə nə var!..

**NƏSR**

**Əfsanə LAÇIN**

## BALACA QAYA

Biri var imiş, biri yox imiş, üç qaya var imış. Biri böyük, o biri balaca, üçüncüsü isə lap balaca. Qayalar dostluq edirdi. Gündüzlər günəş şüaları altında qol-qanad açır, gecələr isə soyuqdan büzüşürdülər. Bir gün "böyük qaya"nın sinəsi çatladı. Xırda daşlar ovulub yerə töküldü. Sən demə bulud göydən hər şeyi görürmüş. O, qayanın çatlamış sinəsini görüb, yaman qorxmuşdu, ona görə də ağlayırdı. Buludun göz yaşları qayanın çatlamış sinəsinə doldu. Səhərə kimi qayanın sinəsində böyük şəlalə əmələ gəldi. Səhər qayalar yuxudan duranda nə görsələr yaxşıdı?! Böyük qayanın sinəsindən şəlalə axır.

Balaca qaya dedi: – Vay, vay sən necə də gözəl olmusan. Əcəb qəşəngsən.

Böyük qaya isə çox məyus idi. Çünki, bilirdi ki, artıq həyatının sonuna az vaxt qalır. Böyük qaya hər gün məhv olurdu. Şəlalə onu yavaş-yavaş sinəsindən oyurdu. Günlər keçirdi, qaya gündən-günə kiçilirdi. Bir gün Böyük qaya daşlara parçalanıb, torpağa qarışdı. Bulud yenə də ağlamağa başladı. Balaca qaya da ağlayırdı.

Günlər beləcə keçirdi. Artıq o biri qayanın da sinəsi çatlamışdı. Quşlar qayanın başına yaman fırlanırdılar. Quşların birinin dimdiyindən qayanın sinəsinə toxum düşdü. Vaxt keçdikcə qayanın sinəsində bir ağac böyüyürdü. Ağac böyüdükcə, qayanın çatları da böyüyürdü. Hər gün qayanın parçaları ovulub, yerə tökülürdü. Ağac da günü-gündən qol-budaq açırdı.

Balaca qaya qorxurdu. Bilirdi ki, çox keçməyəcək tək qalacaq, amma əlindən heç nə gəlmirdi.

Balaca qaya gecədən bərk yuxulamışdı. Hiss edirdi ki, nə isə titrəyir. Yuxudan ayılıb, nə görsə yaxşıdı?! Ağacın gövdəsi o qədər böyümüşdü ki, qaya artıq onun ağırlığına dözə bilmirdi. Qaya titrədi, titrədi, birdən böyük daş parçalarına bölündü. Bulud yenə də ağlayırdı. O qədər ağladı ki, tezliklə daşlardan heç bir əsər-əlamət qalmadı, onlar da əriyib, torpağa qarışdılar.

Balaca qaya tək qaldı. Bir yanından çay axırdı, bir yanında da nəhəng ağac var idi. Ağac meylini qayaya salmışdı. Budaqları qayaya sarı sallanırdı. Qayanı gündüzlər günəşdən, gecələr soyuqdan qoruyurdu. Çay isə ayağının

altından axırdı. Amma o nə ağacı, nə də çayı sevmirdi. O, qayalar üçün darıxırdı. O qədər xiffət çəkirdi ki, içindən oyulurdu.

Onun sinəsində böyük oyuq yaranmışdı. Haradansa bir ayı balası gəlib, özünü oyuğa salmışdı. Qaya onu çox sevirdi. Balaca qaya artıq qaya deyildi. O, balaca mağaraya çevrilmişdi.

**KİTAB RƏFİ**

## SÖZLƏRDƏN GÖRÜNƏN DÜNYA

Pedaqogika üzrə fəlsəfə doktoru, gözəl insan, əsl ziyalı, əvəzsiz dost, yazıçı-publisist Cəbrayıl Qəhrəmanovu on ilə yaxındır ki, tanıyıram. Elə ilk tanışlıqdan mənim üçün doğma bir insana çevrilən Cəbrayıl müəllimin iş prosesində, müəyyən tədbir və yığıncaqlarda müşahidə etdiyim son dərəcə təvazökarlığı, səmimiliyi, xeyirxahlığı, nəcib insani keyfiyyətləri bizi daha da yaxınlaşdırdı. O, milli-mənəvi, əxlaqi-bəşəri dəyərləri: təmiz vicdan, Vətən, xalq, millət üçün məsuliyyət hissini, daxilən azad olmaq, həqiqətpə-



rəstlik və haqq-ədalət hisslərini, heysiyyət və ləyaqət bütövlüyünü zamanın ən mürəkkəb situasiyalarında qoruyub saxlaya bilən nadir ziyalılarımızdandır. Dahi A.Eynşteyn yazırdı ki, insanları öyrətməyin yeganə ağıllı üsulu onlara yaxşı nümunə göstərməkdir. Bu mənada Cəbrayıl müəllimin şəxsində Azərbaycan reallığında belə bir örnək missiyası son dərəcə ibrətamizdir. Çünki Cəbrayıl müəllim öz fəaliyyəti ilə cəmiyyətə, özünü ziyalı hesab edən bir sıra şəxslərə alicənablıq, insanlıq, sadəlik, mədəniyyət, əxlaq və davranış nümunəsi göstərməyi bacarır. Mənim fikrimcə, cəmiyyətin mənəvi balansının qorunması, milli-mənəvi dəyərlər və prinsiplər əsasında insanların davranış qaydalarının kütləvi olaraq normativləşdirilməsi üçün belə şəxslərin varlığına yaşadığımız cəmiyyətdə böyük ehtiyac vardır.

Onu tanıyanların, onunla az-çox ünsiyyətdə olanların hamısı, şübhəsiz, bununla razılaşar ki, bütün bu sadalanan müsbət keyfiyyətlər Cəbrayıl müəllimi xarakterizə edən başlıca cəhətlərdir. Lakin bütün bunlardan başqa onda daha bir "nə isə" var ki, bu da onu digərlərindən fərqləndirən, əksər ziyalılarda olmayan əsas xüsusiyyətdir. Məncə, bu xüsusiyyət – Cəbrayıl müəllimin özündə olan insani xüsusiyyətləri qabartmamaq, onları gözə soxmamaq, bununla da başqalarına mənəvi-psixoloji təsir göstərməmək xüsusiyyətidir. Bütün bu əxlaqi keyfiyyətlər isə onun şəxsiyyət bütövlüyünü müəyyənləşdirən mahiyyət statuslu xarakterinin zahiri təzahürləri, tez nəzərə çarpan görüntüləridir. Məşhur fransız dilçisi Qustav Qiyom idrak nəzəriyyəsinin fundamental prinsipi statusuna layiq ola biləcək belə bir maraqlı fikir irəli sürmüşdür: "Elm belə bir intuitiv dərketməyə əsaslanır ki, görünən dünyanı daim özündə təcəssüm etdirib, lakin qətiyyən bənzəmədiyi gizli şeylərdən "danışır". Dilçi alimin yanaşmasına görə, idraki fəaliyyətin əsas stimulyatoru məhz həmin təzahürlərin dili ilə "danışan" və danışa-danışa idrak sahiblərini gizli dünyanın daha mübhəm sirlərinə doğru səsləyən "nə isə"lərdir. Cəbrayıl müəllim, onun əsl ziyalılığı haqqında düşünərkən Qustav Qiyomun həmin fikrini bir daha xatırlamalı oldum. Çünki Cəbrayıl Qəhrəmanov şəxsiyyəti gerçəkliyin, real aləmin öz strukturunda olduğu kimi, zahiri sadəliyinin arxasında dərin mənəvi zənginlik, idraki mürəkkəblik də gizlədir. Bu sadəlik, eyni zamanda mürəkkəblik, ümumiyyətlə, bu ziyalılıq isə Cəbrayıl müəllimin daxili "Mən"ində sadə, eyni zamanda mükəmməl mənəvi-əxlaqi və mürəkkəb idraki-fəlsəfi əsaslara, əxlaq kredolarına əsaslanır.

C.Qəhrəmanov sabit daxili ruhi-mənəvi harmoniyaya malik olan bir insandır. Ən mürəkkəb situasiyalarda, şəxsən öz mənafeyi əleyhinə yönələn ziddiyyətli vəziyyətlərin yarandığı məqamlarda belə, onun bu daxili ruhi-mənəvi harmoniyası pozulmur. Görkəmli rus ədəbiyyatşünası, akademik Dimitri Lixaçov deyirdi ki, heç kəs özünü yalandan ziyalı göstərə bilməz –

buna onun gücü çatmaz. Sən nə qədər öz şəxsi mənafeyindən güzəştə gedə bilirsənsə, bir o qədər ziyalısan. Cəbrayıl müəllimin əsl ziyalı kimi şəxsində nəinki şəxsi mənafedən keçən güzəştin sərhəddini, heç şəxsi mənafeyin özünü belə təsəvvür etmək, duymaq olmur. Onunla dostluq etdiyim on ilə yaxın bir müddətdə Cəbrayıl müəllimin öz marağını ictimai maraqdan üstün tutmasını, yaxud şəxsi maraqlarını pərdələnmiş şəkildə təqdim etməsinin heç vaxt şahidi olmamışam. Məncə, bunun əsas səbəblərindən biri, bəlkə də, başlıcası Cəbrayıl Qəhrəmanovun Şərq və Qərb əxlaq kodeksini, onun komponentlərini dərindən bilməsi və davranışlarında onlara son dərəcə dəqiqliklə əməl etməsidir…

Cəbrayıl müəllimin idraki düşüncə tərzinə ilk baxışdan sezilməyən, lakin sonradan, tədricən, müəyyənləşən dərinlik və genişlik xasdır. İşlərinin kifayət qədər çox olmasına baxmayaraq, Cəbrayıl müəllim iş prosesində ara-sıra yaranan ən kiçik fürsəti belə kitab oxumağa, düşündüklərini kağıza köçürməyə həsr edir. Onun dünya elminin, xüsusilə fizika, pedaqogika, fəlsəfə və ədəbiyyatın ən müasir inkişaf tendensiyaları ilə bağlı zəngin informasiyaları, həmin informasiyaları aydın şəkildə sistemləşdirən səlis məntiqi var. C.Qəhrəmanov istənilən elmi-fəlsəfi, ədəbi-publisist məsələlərdə bəhs edilən problemin birbaşa mahiyyətinə varmaq, onu dəqiqliklə anlamaq qabiliyyətinə malikdir. Belə məsələlərdə Cəbrayıl müəllimin məntiqi dəqiq və anlaşıqlı olur. Məncə, onun idrakının, təxəyyülünün gücü heç nəyi, hətta öz şəxsi elmi-fəlsəfi, bədii-publisist qənaətlərini belə mütləqləşdirmir. Ancaq Cəbrayıl müəllim hətta obyektiv xarakterli subyektiv təsiri bağışlayan elmi qənaətlərini, mülahizələrini də digər alim və ziyalıların əksəriyyətindən fərqli olaraq, sağlam məntiq və dərin idraki dəlillərlə əsaslandırmağı bacarır.

"Bircə onu bilirəm ki, heç nəyi bilmirəm" – deyən, dünyanın yeddi müdrikindən biri hesab edilən qədim yunan filosofu Sokratdan üzü bəri biliyə münasibətdə bu müdrik yanaşma zaman-zaman dünyanın ən müxtəlif fikir nəhəngləri tərəfindən təkrar-təkrar qeyd olunub. Azərbaycan elmi-ictimai təfəkkürünün XX əsrdə yetişdirdiyi mütəfəkkirlərdən biri olan Yaşar Qarayev də bu məlum həqiqəti özünəməxsus şəkildə belə ifadə edib: "Kainatın işıq-qaranlıq arifmetikasında "məlum" adi nisbətlə dəyişəndə "naməlum" həndəsi nisbətlə dəyişir. Nurun, işığın hər zərrəsi bir dəfə artanda, ondan görünən qaranlığın (məchulluğun) sahəsi, həcmi yüz dəfə böyüyür. Təkcə o, – heç nəyi bilməyən qafil hər şeyi bildiyini zənn edir və bilmir ki, nəyi isə öyrənəndə sən nəyi bilmədiyini də dərk edirsən..." Bu mənada Cəbrayıl müəllim elmin, ədəbiyyat və incəsənətin min illər ərzindəki praktiki və nəzəri təcrübəsini özündə ehtiva edən saysız-hesabsız elmi fikirlərin, mülahizələrin bir insan ömründə kiçik zərrəsinə belə sahib olmağın qeyri-müm-

kün olduğunu dəfələrlə qeyd edib. Belə hərtərəfli yaddaşa və iti idraka malik olmasına rəğmən, dəfələrlə Cəbrayıl müəllimin öz yaradıcılığı haqqında təvazökarcasına ancaq "cızma-qara edirəm" deməsi də, mənim fikrimcə, intəhasız bir sevgiyə, hörmətə layiq olan həddən ziyadə təvazökarlıq və əsl ziyalılıqdır...

Zaman-zaman çox insanlara nümunə olacaq bu ziyalının, tədqiqatçı-alimin araşdırmalarını, ədəbi-bədii yaradıcılığını, 50-dən çox elmi, elmi-publisist, publisist, ədəbi-bədii və metodiki məqalələrini, yazılarını, o cümlədən "Abbasqulu Abbaszadənin elmi-pedaqoji irsi" (Bakı, Pedaqogika, 2005, 196 s.) "Düşüncələr işığında" (Bakı: Elm, 2008, 316 s.), "Ömür bitər, yol bitməz" (Bakı: Elm və təhsil, 2013, 524 s.) kitablarını oxuyanda mənə elə gəlib ki, Cəbrayıl Qəhrəmanov bir neçə ali təhsil alıb. Çünki Cəbrayıl müəllim bu kitablarında, eləcə də bu mövzuda yazdığı məqalələrində, yazılarında cəmiyyətdə, həyat və məişətdə, ədəbiyyatda... baş verən hadisələri ümumiləşdirərək o qədər professionallıqla qələmə almış, o qədər qiymətli məlumatlar, əvəzsiz bilgilər vermişdi ki, mən istər-istəməz bu fikrə gəlmişdim...

Sayca müəllifin dördüncü kitabı olan 378 səhifəlik "Gördüyüm dünya" kitabı cəmiyyətdə, həyat və məişətdə, elmdə, ədəbiyyatda, iqtisadiyyatda... baş verən müxtəlif həyat hadisələrinə, qanunauyğunluqlara, əxlaqi-mənəvi dəyərlərə həsr edilmişdir. Başqa sözlə, C.Qəhrəmanov bu kitabda sözlərlə, fikirlərlə, düşüncələrlə özünün gördüyü söz dünyasını yaratmışdır... Kitabda müəllifin bu mövzulara münasibətini ifadə edən esse və gündəlikləri, pedaqoji və ədəbi düşüncələri, çıxışları, habelə tanınmış alim və qələm adamlarının müəllifin yaradıcılığına münasibəti öz əksini tapmışdır.

"Gördüyüm dünya" kitabı beş bölmədən ibarətdir: "Esselər və gündəliklər", "Sözün cazibəsi", "Ədəbi düşüncələr", "Pedaqoji düşüncələr" və "Rəylər, mülahizələr".

Kitabın ilk bölməsi "Esselər və gündəliklər" adlanır. Məlumdur ki, **esse** kiçik və ya orta həcmdə olan, bir çox elmi sahəyə müraciət olunan nəsr janrıdır. Tənqid və ədəbiyyatşünaslığın müəyyən bir problemi sərbəst surətdə izah etməsi ilə fərqlənən ədəbi janrdır. Daha çox ədəbiyyatda istifadə olunur. Essedə məqsəddəki fikri bildirmək üçün fəlsəfi ifadə, yanaşma, təhlildən istifadə edilir. Ədəbiyyatşünaslıq, avtobioqrafik, bioqrafik məqalələr, psixoloji, tarixi, politoloji, siyasi və b. təhlillər əsasən esse janrı üzərində qurulmuşdur.

Esse problemin sərbəst şəkildə qoyuluşudur. Essenin müəllifi seçdiyi problemi (ədəbi, etik, fəlsəfi və s.) təhlil və izah edərkən ifadə tərzinin sistemli, ardıcıl, gəldiyi nəticələrin əsası, hamı üçün eyni dərəcədə məqbul olması qayğısına qalmır. Essenin əsasını fransız yazıçısı və humanist filo-

sofu M. Monten qoymuşdur.

**Gündəlik** isə bir şəxsin həyatında və mənəvi aləmində baş verən hadisələri günbəgün əks etdirən yazı növüdür. Bəzən bədii əsərlər də gündəlik formasında qələmə alınır. Belə əsərlər iki cür olur: ya yazıçı şəxsən iştirak etdiyi hadisələri, fikir və həyəcanlarını ardıcıl surətdə yazır, ya da əsər yazıçının qəhrəmanı tərəfindən yazılan gündəlik şəklində olur. Belə əsərlərdə həmin qəhrəmanın həyatının ən mühüm hadisələri birinci şəxsin dilindən nağıl edilir. Avropa ədəbiyyatında XIX əsr fransız dramaturqu, yazıçısı Jül Renarın, Rusiyada rus yazıçı və dramaturqları İ.S.Turgenev, V.K.Korolenko, M.Y.Saltıkov-Şedrin və başqalarının gündəlikləri daha məşhurdur.

"Gördüyüm dünya" kitabının "Esselər və gündəliklər" bölməsində toplanan esselər və gündəliklərdə də bu janrların tələblərinə uyğun olaraq Cəbrayıl Qəhrəmanovun mövcud ictimai quruluşa, həyata, ədəbiyyat və incəsənətə, ədəbi-fəlsəfi fikirlərə və digər sənətkarlıq məsələlərinə aid fikirləri, düşüncələri əsas yer tutur. Bu esselər və gündəliklərdə müəllif mülahizə və düşüncələrini əsaslandırmaq üçün dünya siyasətinin, ədəbiyyatının və fəlsəfi düçüncəsinin nəhəng simaları olan – Heraklit, Siseron, Zenon, Ezop, Makedoniyalı İsgəndər, Məhəmməd peyğəmbər, Həzrət Əli, İ.Nyuton, A.Eynşteyn, Napoleon, M.K.Atatürk, O.Bismark, S.Bolivar, N.Tusi, S.Şirazi, N.Gəncəvi, Y.İmrə, M.C.Rumi, Ş.Təbrizi, İ.Kant, F.Nitşe, Əbu Turxan, H.Cavid, V.Höte, A.Frans, F.Kafka, L.N.Tolstoy, M.Qorki, S.Vurğun, B.Vahabzadə, B.Şou, N.Makiavelli, F.M.Dostayevski, K.Uşinski, B.Franklin və onlarla başqalarının fikirlərindən çoxlu sitatlar gətirir, bu nümunələri yeri gəldikcə yazılarına epiqraf kimi veir.

Bəzən qalın-qalın kitablardan ala bilmədiyimiz, diqqət yetirmədiyimiz hansısa müdrik fikri, qanadlı sözü, aforizmi, bəşəri informasiyanı, yüksək ədəbi-bədii, fəlsəfi fikirləri C.Qəhrəmanovun bir essesindən və ya gündəliyindən oxuyuruq. Məsələn,

*"Küllin mahiyyəti zərrələrin harmoniyasından əhəmiyyətli dərəcədə asılıdır."* (**Dünyanın mahiyyəti, zərrələrin harmoniyası**),

*"Ziyalı xalqın taleyinə yanan, onun ağrıları ilə yaşayan bir insandır."* (**Ən böyük sərvətimiz – ziyalı**),

*"Yaddaş onun üçündür ki, səhvlərini təkrar etməyəsən."* (**Bağışlamağı bacarıram, amma...**),

*"Qarşıya çıxan çətinliklərə, maneələrə sonu müvəffəqiyyətlə bitən bir sınaq kimi baxmaq lazımdır."* (**Hər çətinlik bir sınaqdır**),

*"Bir-birimizə olan tərifimiz də, tənqidimiz də sevgidən yaranmalıdır, maddiyyata, şəxsi mənafelərə istəkdən yox."* **(Birlik, yoxsa "su barışığı?")**,

*"Zirvədən baxmaq üçün onu fəth etmək lazımdır".* (**Dağ və düşüncə zirvəsi)**,

*"Gələcək nəsillər keçmişdən qürur duymaqla yanaşı, babalarının səhvlərindən nəticə çıxarmağı da öyrənməlidirlər."* (**Tarix və həqiqət**),

*"Sənətkar adları və fəxri adlar bir-birinə işıq və yaraşıq verməlidir."* **(Fəxri adlar barəsində),**

*"Yaxşı xərcləmək, lazım olan yerə xərcləmək elə yenidən qazanmaq deməkdir."* (**Qazanmaq, qorumaq və xərcləmək**),

*"Kollektiv idarə rəhbərinin, xalq, millət isə dövlət başçısının güzgüsüdür."* (**Kollektiv – rəhbərin güzgüsü**),

*"Həyatda o insan xoşbəxtdir ki, dünyanı gözəl görür, hətta gözəl olmayanı da gözəlləşdirməyə çalışır."* (**Dünyanı gözəl görə bilsən)**,

*"...Nöqsanlar həm də hərəkətə, fəaliyyətə çağırışdır,"* (**Hər gözəlin bir eybi)** və s.

Gətirdiyimiz bu nümunələrdə mötərizədəki esse adlarının yerinə "Cəbrayıl Qəhrəmanov" imzası yazılsaydı, onları oxuyan hər kəs bunları məhz aforizmlər", "hikmətli sözlər", "müdrik kəlamlar", "qanadlı ifadələr" və ya "nəsihətlər" kimi qəbul edərdi. "Esselər və gündəliklər" bölməsində toplanan esselər və gündəliklər haqqında bizim də bir qənaətimiz var. Qəti inanırıq ki, Cəbrayıl Qəhrəmanovun yuxarıda verilən bu kəlamlarından, fəlsəfi düşüncələrindən ən azı bir neçəsi həssas, diqqətli oxucunun yaddaşında qalacaq, uzun müddət onun hafizəsindən silinməyəcək...

Müəllifin "Gördüyüm dünya" kitabına daxil etdiyi ilk esse "Ağıl və ürək" adlanır. Fikrimizcə, bu essedən çıxan ideya – "Ağlın işi heyrət doğurur, ürəyin işi nə isə dəruni bir sevinc"dir. Cəbrayıl Qəhrəmanov bu essesində yazır: "Ürək çox maraqlı və gərəkli, insanı sevdirən bir faktordur. Ağıllı adama nisbətən ürəkli adamları daha çox sevirlər. Elə qəhrəmanlar da, xalq və millət yolunda, haqq-ədalət yolunda fəda olanlar da əksərən ürəkli adamlardır. Ağıllı adamlar, bəzən, ya həqiqət, yaxud Vətən uğrunda, olum-ölüm məsələsində cismani "yaşamağı" daha üstün tuturlar. Dahilərdən kimsə deyib: "Ürək təbiətin möcüzəsidir"... Çox vaxt ağılla ürək tərs mütənasib olur. Yəni biri nə qədər çox olursa, o biri bir o qədər az olur. Əsas odur ki, bunu dərk etdikdən sonra az olanı artırmaq qayğısına qalasan."

Mənəvi potensialı Şərq və Qərb mədəniyyətlərinin sintezi məqamlarında formalaşan Azərbaycanda ziyalıların dünyagörüşünə, əxlaq və davranışına bu oriyentirlərdən yanaşma ayrıca bir söhbətin mövzusudur. Son dövrlər Azərbaycan ziyalılığını bu qütblər aspektindən dəyərləndirmə tendensiyaları hiss olunur. Bu təsnifata görə, Azərbaycan ziyalısı iki fərqli qrupa bölünür: rus mədəni mühitində formalaşmış, ümumbəşəri universali-

lər kimi təqdim olunan Qərb dəyərlərinə malik, mədəni, geniş dünyagörüşlü, lakin milli tarixə, milli mədəniyyətə və mənəviyyata, islami dəyərlərə nisbətən yad ziyalı; bir də milli zəmində formalaşmış, milli mədəniyyətimizin ümumtürk və ümumşərq kontekstlərinə bağlı, Azərbaycan mədəni mühitinin yetişdirməsi olan ziyalı. Cəbrayıl Qəhrəmanovun esselərindən biri – "Ən böyük sərvətimiz – ziyalı" bu mövzuya – ziyalılıq mövzusuna həsr edilmişdir. Müəllif yazır: "Ziyalının insanların taleyində, millətin tarixində və inkişafında rolu hamıya gün kimi aydındır. Uzaq keçmişə getmədən Azərbaycan xalqının son yüz ildəki ziyalıları haqqında düşünərkən çox az insan yada düşür. H.Cavid, S.Mümtaz, M.Müşfiq, Y.V.Çəmənzəminli, Ə.Cavad, B.Çobanzadə, S.Vurğun, R.Rza, Ə.Kərim, B.Vahabzadə, Z.Bünyadov, X.Məmmədov... və adını çəkə bilmədiyim, deyək ki, daha yüz nəfər. Bu rəqəm doqquz milyonluq bir xalq üçün çox azdır. Sözsüz ki, söhbət Şimali Azərbaycandan gedir. Onları müzakirə etmədən elə yaşadığımız hal-hazırkı vaxtdan danışaq. Mənim düşüncəmə görə, bu gün də onlar çox azdır. Və cəmiyyətə təsir edəcək gücdə deyil. Təəssüf edirəm ki, ziyalı dedikdə əksəriyyət, hətta ali təhsilli, alimlik dərəcəsi olan bəzi insanlar da diplomlu adamları nəzərdə tuturlar. Çox təəssüf!" Ancaq Cəbrayıl Qəhrəmanovun qənaətinə görə, "ziyalı" deyiləndə başqa parametrlərə malik olan şəxs başa düşülməlidir: "Ziyalı anlamına çox parametrlər daxildir. Əvvəla hamının bildiyi kimi ziyalı – işıqlı, doğru yol göstərən deməkdir. Yaxşı nə varsa bunlar işıqlı cəhətlərdir: savadlılıq, düzlük, halallıq, xeyirxahlıq, səxavətlilik, saflıq, humanistlik, haqq-ədalət uğrunda mübarizə... Sözsüz ki, ziyalının əsas tərəflərindən biri onun savadlı, elmli, bilikli olmasıdır. İkincisi, bu biliyi yaxşı məqsədlər üçün insanların xeyrinə işlətməsidir. Bildiyimiz kimi, savadsıza bisavad deyirlərsə, biliyini pis işlərə yönəldən insana isə basavad deyirlər. Deməli, ziyalı bisavad və basavad yox, ilk növbədə savadlı olmalıdır.

Ziyalı hər zaman xalqın və həqiqətin tərəfində olan ləyaqət və vicdan sahibidir. O, insanlıq yolunda, millətin tərəqqisi və inkişafı uğrunda vicdanla çalışmalı, yeri gəlsə, haqq-ədalət uğrunda canından keçməyi belə bacarmalıdır... O xalq böyük xalqdır ki, qəhrəmanlara ehtiyac duymur. Çünki əksəriyyəti işıqlıdır, ziyalıdır. Hər bir ziyalı isə həm hər an, həm də potensial qəhrəmandır."

Cəbrayıl Qəhrəmanov "Ümid, qətiyyət və ruhun gücü" essesində maraqlı, eyni zamanda yeni və orijinal sayıla biləcək bir fikri də ədəbi dövriyyəyə buraxır. O, yazır: "Həmişə bu düşüncədə olmuşam ki, ümid, qətiyyət və ruh insanın həyat və fəaliyyət üçbucağının tərəfləridir. Əgər insanda bu üç cəhət güclüdürsə, yəni heç zaman ümidini itirmirsə, həmişə qətiyyətli və yüksək ruha malikdirsə, o, hər zaman nailiyyət qazanacaq. Belə deyək ki,

insan öz həyat və fəaliyyətinin, əməllərinin yekunu olaraq yaratdığı abidənin elementlərinin tərəfləri bu üç güclü, insani və iradi keyfiyyətlərdən – ümid, qətiyyət və yüksək ruhdan təşkil olunmuş üçbucaqdan ibarətdirsə, bu abidə olduqca möhkəm və möhtəşəm olacaq". Müəllif essedə ümid, qətiyyət və ruhun gücünə müstəsna əhəmiyyət verir və insanları hər zaman bütün çətinliklərdən çıxara bilən ümid, qətiyyət və ruhun gücünə çox inandığını vurğulayır.

Kitabın "Esselər və gündəliklər" bölməsində toplanan "Dünyanın mahiyyəti, zərrələrin harmoniyası", "Allahın verdikləri və özümüzün qazandıqları", "Əbədi işıq", "Tərbiyə – insanın yaraşığı", "Nyuton qanunları və insan münasibətləri", "Fərd, millət və xoşbəxtlik", "Valideyn təlaşı, yaxud sevgidən qorxu", "Abışın vimi", "Birlik və pərdə", "Bilik çoxaldıqca, suallar çoxalır", "Əxlaq – mədəniyyətin güzgüsü", "Milləti qoruyan dəyərlər", "Kədərli gözlər – mənalı gözlər", "Məni öyən də, söyən də sənsən", "Qədirbilməzlik", "Eşq nədir?", "Tanrının insan qəlbinə əkdiyi sirr", "Ustad dərsi" və başqa esse və gündəliklər də diqqət çəkir, maraqla qarşılanır.

"Gördüyüm dünya" kitabının ikinci bölməsi "Sözün cazibəsi" adlanır. C.Qəhrəmanov bu bölmədə özünə, qəlbinə, düşüncələrinə yaxın olan müdrik fikirlərdən, aforizmlərdən nümunələr vermiş və eyni zamanda bəzən onları şərh etmiş, münasibət bildirmişdir.

Kitabın üçüncü bölməsinə müəllif "Ədəbi düşüncələr" adını vermişdir. Burada C.Qəhrəmanov daha çox ədəbiyyatşünas-tənqidçi kimi nəzərə çarpır. Bu bölməyə müəllifin son dövrdə yazdığı "Sözün şeir zirvəsi" və "Xalq deyimləri ilə zəngin poeziya" yazıları daxil edilmişdir. Bu məqalələrdə Cəbrayıl Qəhrəmanov ədəbi aləmdə baş verən hadisələrə münasibətini bildirir və tanınmış şair İlham Qəhrəmanın şeirlərini təhlil edir, bu ədəbi nümunələrin lazımi qiymətini verir. Bu bölmədə toplanan yazılarda artıq C.Qəhrəmanov bir alim, bir tədqiqatçı kimi görünür. Müəllifin bu mövzulu yazıları maraqlı elmi mülahizələrlə zəngin olub, müəllifin çox cəhətli elmi araşdırmalar aparmaq qabiliyyətinin bariz nümunəsidir. C.Qəhrəmanovun bu tipli yazıları elmi dəyəri baxımından əhəmiyyətlidir və maraqla qarşılanır.

"Gördüyüm dünya" kitabında dördüncü bölmə "Pedaqoji düşüncələr" adlanır. Bu bölmədə C.Qəhrəmanovun "Xalq Cümhuriyyəti dönəmində Azərbaycanda elm, təhsil və mədəniyyət quruculuğu", "Hüseyn Cavidin maarifçilik ideyaları və pedaqoji görüşləri", "Yaxşı müəllim haqqında düşüncələrim", "Fizika fənninin tədrisində elmi dünyagörüşü və tərbiyə məsələləri", "90 yaşlı Güləbird məktəbi", "Repetitorluq fəaliyyəti və hazırlıq kursları", "Görkəmli pedaqoq və xalq rəssamı Nadir Əbdürrəhmanov"

məqalələri toplanmışdır.

Bu bölmədəki maraqlı məqalələrdən biri "Hüseyn Cavidin maarifçilik ideyaları və pedaqoji görüşləri" adlanır. Məlumdur ki, Hüseyn Cavid çoxəsrlik Azərbaycan ədəbiyyatının ən yaxşı ənənələrini inkişaf etdirən və zənginləşdirən qüdrətli söz ustası olmuşdur. Mütəfəkkir şair, görkəmli dramaturq Hüseyn Cavid Azərbaycan ədəbiyyatı tarixində orijinal ədəbi simalardan biridir. Minillik Azərbaycan ədəbiyyatının XX əsr Azərbaycan romantizmi daha çox Hüseyn Cavidin adı ilə bağlıdır. O, öz yaradıcılığı ilə, dərin hikmətli və fəlsəfi poeziyası, təkrarsız dram əsərləri ilə Azərbaycanda milli şüurun intibahına misilsiz xidmət göstərmişdir. 1937-ci il repressiyalarının qurbanı olmuş H. Cavidin yaradıcılığındakı romantik əhvali-ruhiyyə, ilk öncə, türk millətinin sabahına olan sonsuz inamdan qidalanırdı. Onun ölməz əsərləri XX əsr Azərbaycan ədəbiyyatının mürəkkəb, çoxşaxəli və zəngin mühitində öz səsi və nəfəsi ilə seçilən mühüm bir ədəbi hadisə kimi bu gün də öz məna və əhəmiyyətini saxlamaqdadır.

Bütün bunlara görə də Hüseyn Cavidin zəngin və parlaq yaradıcılığı, qeyri-adi istedadı və nakam taleyi daim böyük maraq doğurub. C.Qəhrəmanov da yaradıcılığında bu böyük sənətkarın yaradıcılığına biganə qalmamış, ona bir neçə məqalə həsr etmişdir. Müəllifin belə məqalələrindən biri "Hüseyn Cavidin maarifçilik ideyaları və pedaqoji görüşləri" adlanır. C.Qəhrəmanov bu məqalədə H.Cavidin maarifçilik ideyaları və pedaqoji görüşlərinə ətraflı işıq salır və yazır: "Hüseyn Cavidin adı çəkiləndə ilk olaraq mütəfəkkir bir şair-dramaturq, filosof, həqiqət üstündə dara çəkilən, Sibirə sürgün edilən bir millət, Vətən aşiqi gəlir gözlərimiz önünə. Onun zəngin irsi ilə yaxından tanış olanlar bilirlər ki, Hüseyn Cavid həm də bir maarif fədaisi idi. O, pedaqoji fəaliyyətlə yanaşı, öz çıxışları, məktub və məqalələri ilə xalqın maariflənməsinə, yeni məktəblər açılmasına çalışmış, millətin nicat yolunu böyüməkdə olan gənc nəslin yüksək elm və təhsil almasında görmüşdür." Bundan sonra müəllif H.Cavidin bu mövzuda yazdığı məqalə və məktublarının – 1904-1915-ci ildə "Şərqi-Rus", "Həqiqət", "İqbal", "Açıq söz" qəzetlərində yazdığı "Urmiyədən məktub", "Urmiyədən", "Naxçıvandan təbsirə", "Naxçıvanda nə gördüm?", "Naxçıvana nə lazım?", "Həsbi-hal", "Mirzə Abdulla Məhəmməd, yaxud – Abdulla Tofiq" (A.Sur), "Tiflisdə "İttifaq" məktəbi" məqalələri, həmçinin "M.T.Sidqiyə məktublar", "Q.Şərifzadəyə məktublar"ının adını çəkir. C.Qəhrəmanov qeyd edir ki, H.Cavidin məhz bu məqalə və məktublarında maarifçilik ideyaları və pedaqoji görüşləri xüsusilə diqqəti cəlb edir.

C.Qəhrəmanov bu məqalə və məktubları, geniş, hərtərəfli təhlil etdikdən sonra bu qənaətə gəlir: "Bu məqalələri oxuduqca onun xalqı, milləti

üçün necə yanmasının, onun necə bir yanğıyla millətinin savadlanmasına çalışmasının, müəllimlik sənətini incəliklərinə qədər bilən bir ustad pedaqoq olmasının, dərin pedaqoji fikirlər sahibi olduğunun şahidi olursan. Cavidin bir çox məqalə və məktublarında o zamankı Azərbaycanda həm şagirdlər üçün qız və oğlan məktəblərinin, həmçinin müəllim hazırlayan məktəblərin yaradılması, mövcud olan məktəblərdə tədris işinin yüksək səviyyədə qurulması, proqram və dərsliklərin yaradılması, müəllimlərin elmi-metodik səviyyəsinin yüksəldilməsi, dərs prosesinin bir çox pedaqoji-psixoloji amilləri və bir sıra digər məsələlər ustad bir pedoqoq-alim səriştəsiylə öz əksini tapmışdır... Bəli, Cavid Vətənini, millətini belə sevirdi. Onun parlaq ziyası böyük bir məşələ dönüb Vətənin hər bir guşəsinə işıq saçırdı. Bu məşəlin işığı bu gün də qaranlıqları işıqlandırmaqda, bu atəşin odu yenə də qəlbləri isitməkdədir”.

Kitabın “Çıxışlar” adlanan beşinci bölməsinə C.Qəhrəmanovun müxtəlif vaxtlarda kütləvi infomasiya vasitələrində, xüsusən televiziyalarda və ayrı-ayrı tədbirlərdə etdiyi çıxışlar daxil edilmişdir.

Hər bir ədəbi zövqü olan bədii düşüncə sahibinin, qələm əhlinin daha çox üstünlük verdiyi, qəlbən sevdiyi mövzuları olur. Bu baxımdan Cəbrayıl Qəhrəmanovun yaradıcılığına yanaşılarsa, onun ən çox sevdiyi mövzulardan biri VƏTƏN, YURD mövzusudur. Onun yaradıcılığında doğma yurdun gözəllikləri, Vətənə, torpağa bağlılıq, Qarabağ, vətən həsrəti geniş yer tutur. Orijinal düşüncə sahibi olan Cəbrayıl Qəhrəmanovun yaradıcılığında Vətənə, əbədi və əzəli hiss olan məhəbbətə, təbiət və cəmiyyət hadisələrinə özünəməxsus yanaşma tərzi hiss olunur. Azərbaycan ədəbiyyatında Vətənlə bağlı yazılmış əsərlərin ümumi mənzərəsinə diqqət yetirsək, burada bütöv halda Azərbaycanın bənzərsiz gözəlliklərindən, yurdumuzun igid, qəhrəman övladlarından, tariximizin şərəfli səhifələrindən və s. mövzulardan poetik bir dillə bəhs olunur. Lakin Cəbrayıl Qəhrəmanovun Vətən mövzusunda yazılmış yazılarını, məruzə və çıxışlarını bu mövzuda yazılmış başqa yazılardan fərqləndirən mühüm cəhətlər də vardır. Bu cəhətlərdən biri bu yazılarda yaşadığımız dünyanın təzadlarının və bu təzadların fonunda işğala qədərki Laçın və işğaldan sonrakı Laçının indi qərib qalan ruhunun səmimi, eyni zamanda ürək ağrısı ilə əks etdirilməsidir.

Ümumiyyətlə, kitabdan çıxan bu qənaətlər əsasən obyektiv, güclü məntiqə əsaslanan ümumiləşdirmələr olub, oxucunu istər-istəməz sürətlə şütüyən zaman və yaşadığımız elm-texnika əsrində hər an yeniləşən həyat haqqında dərindən düşünməyə və müəllifin gəldiyi qənaətlərlə razılaşmağa sövq edir. Müəllifin müxtəlif janrlarda yazdığı bu yazılarında özünün şirin təhkiyəsi, sadə, anlaşıqlı dili, çeşidli üslubu, incə, psixoloji fəhmi, fəlsəfi

təfəkkürü və cəmiyyətdə baş verən hər bir hadisəyə çox həssas yanaşması ilə yadda qalır, sevilir.

"Gördüyüm dünya" kitabının sonuncu – altıncı bölməsi "Rəylər, mülahizələr" adlanır. Bu bölməyə tanınmış alim-jurnalist Şamxəlil Məmmədovun "Düşüncələr işığında", "Gənclik" qəzetinin baş redaktoru, Məcburi Köçkünlər Birliyinin sədri Kərim Kərimlinin "Qələmin müqəddəs vəzifəsi...", filologiya üzrə fəlsəfə doktoru, dosent, AMEA Folklor İnstitutunun aparıcı elmi işçisi Tahir Orucovun "Ensiklopedik dəyərli kitab", şair-publisist Rövşən Atakişioğlunun "Ulu yurdum – Güləbirdim", şair-publisist Əbülfət Mədətoğlunun "Ömür bitər, yol bitməz", BDU-nun əməkdaşı, Qarabağ müharibəsi veteranı Ramiz Qənimətoğlunun "Yaxşılığı yaşadan insan", "Laçın" qəzetinin baş redaktoru Mayıl Xanların "Olduğu kimi görünən insan" və "Pillələr" qəzetinin baş redaktoru Şöhlət Abbasın "Bir kəndin ensiklopediyası" yazıları daxil edilmişdir. Bu yazılarda Cəbrayıl Qəhrəmanovun "Düşüncələr işığında" və "Ömür bitər, yol bitməz" kitabları haqqında müxtəlif peşə adamlarının fikirləri, düşüncələri və qənaətləri verilmişdir.

Ümumiyyətlə, "Gördüyüm dünya" kitabının bu bölməsindəki yazılarda C.Qəhrəmanov həssas bir insan, istedadlı yazar, nəhayət, qeyrətli bir vətəndaş kimi təqdim edilir. Qeyd edilir ki, adları çəkilən kitablarda müəllifin təsvir etdikləri hadisələr yaşadığımız bu həyatın reallıqları haqqında özünəməxsus duyğu və düşüncələri, rastlaşdığı gerçəkliklər, tanıdığı, müsahib olduğu insanlar barəsində gördüyü yaşam həqiqətlərinin ümumiləşdirmələri, mənzərələri və real gerçəklikləridir.



Bütün bunları nəzərə alaraq əminliklə deyə bilərik ki, istedadlı qələm sahibi, zəngin yaradıcı təxəyyülə, geniş intellektual səviyyəyə malik olan C.Qəhrəmanovun "Gördüyüm dünya" kitabı son illər bu mövzuda yazılan əsərlər içərisində ən öncül sırada özünəməxsus bir yer tutacaq və oxucular tərəfindən böyük maraqla qarşılanacaqdır.

**Tahir ORUCOV,**
***filologiya üzrə fəlsəfə doktoru, dosent,***
***AMEA Folklor İnstitutunun aparıcı elmi işçisi***

**MƏKTƏBLƏRİMİZ**

## LAÇIN RAYON 127 SAYLI TEXNİKİ PEŞƏ MƏKTƏBİNİN 44 İLLİK FƏALİYYƏTİ




Haqqında söhbət açdığımız təhsil müəssisəsi Laçın rayonunda 1971-ci ildən sonrakı dövrdə gənclərin müxtəlif peşələrə yiyələnməsində ictimai və şəxsi təsərrüfatların inkişafında mühüm rol oynamış sənət məktəbidir.

Ümummilli liderimiz Heydər Əliyev 1969-cu ildə Azərbaycan SSRİ Mərkəzi Komitəsinin 1-ci katibi seçiləndən az sonra respublika üzrə dağ rayonlarının sosial-iqtisadi inkişafının təmin edilməsi ilə əlaqədar mühüm qərarlar qəbul edildi. Həmin rayonlardan olan gənclərin güzəştli şərtlər ilə respublikanın ali məktəblərinə qəbul edilməsi təmin edildi. Yerlərdə yeni-yeni sənaye müəssisələri, məktəblər, xəstəxanalar, ticarət obyektləri istifadəyə verildi. 1971-ci ildə Azərbaycan SSR Texniki Peşə Təhsili Komitəsinin sədri Tofiq Allahverdiyevin əmri ilə Laçında Bərdə kənd Texniki Peşə məktəbinin filialı yaradıldı. Tofiq Allahverdiyevin təşəbbüsü ilə onun yaxından tanıdığı, zəngin həyat təcrübəsinə, savada malik olan, müxtəlif partiya-sovet işlərində mühüm vəzifələrdə işləmiş Əliş Tanrıverdiyevin Laçında yeni yaradılan Texniki Peşə məktəbinə direktor təyin edilməsi təklifi

rayonun o zamankı rəhbəri Muradxan Cabbarov tərəfindən müsbət qarşılandı. Xatırladım ki, Əliş müəllimin 1929-cu ildən Laçın Rayon Partiya Komitəsində şöbə müdiri, rayon İcraiyyə Komitəsində sədr, Təhsil Şöbəsində müdir, Telman adına kolxozda sədr işlədiyini və Böyük Vətən müharibəsi zamanı döyüşlərdəki fəaliyyətini nəzərə alan respublika rəhbərliyi onu SSRİ-nin ali dövlət mükafatları hesab olunan “Lenin” ordeni, “Şərəf nişanı” ordeni və “Qırmızı bayraq” ordeni ilə təltif etmişdir. Əliş müəllimin o dövrdəki fəaliyyətində əsas məqam Laçın Rayon Texniki Peşə məktəbinin müstəqil olmasını təmin etmək, məktəbin maddi-texniki bazasını genişləndirmək və güclü kadr potensialına malik olan məktəb yaratmaq olmuşdur. Nəzərə alsaq ki, o dövrdə Laçın rayonunda ali və orta ixtisas təhsili olmayan gənclər çoxluq təşkil edirdi, o zaman rayonda yeni yaradılan peşə məktəbinin fəaliyyətini daha düzgün qiymətləndirmək olar. Məktəb rəhbərliyi rayonun bütün kəndlərinə nümayəndələrini göndərərək gəncləri peşə təhsilinə cəlb edərək onlar üçün məktəbdə lazım olan şəraiti yaratmağa çalışırdı.

Azərbaycan SSR Nazirlər Sovetindəki və Respublika Peşə Təhsili Komitəsindəki əlaqələrindən istifadə edən Əliş müəllim 1973-cü ildə Laçın şəhərində müstəqil Laçın rayon kənd orta Texniki Peşə məktəbi yaradılmasına nail oldu. Az müddətdə rayonun qabaqcıl müəllimləri Peşə məktəbində iş ilə təmin edilərək onların normal fəaliyyəti üçün lazım olan şərait yaradıldı. Məktəbdə orta təhsil bazası üzrə 1 illik, 9 aylıq və 6 aylıq qruplarda təhsil alan gənclərə sənət diplomu verməklə yanaşı, təhsil müddətinə aylıq təqaüdlər verilməsi onların maddi durumuna müsbət təsir göstərmişdir. 3 illik təhsil bazası üzrə təhsil alan gənclər isə gündəlik yeməklə və yataqxana ilə təmin edilirdilər. Məktəbi müvəffəqiyyətlə bitirən gənclərə sənət diplomu ilə birlikdə orta təhsil almaları barədə attestat verilirdi. Laçın Peşə məktəbini həmin dövrdə bitirmiş çoxlu sayda gənclər respublikanın müxtəlif ali və orta ixtisas məktəblərini bitirərək peşəkar mütəxəssislər olduqları üçün Laçın Peşə məktəbini minnətdarlıqla xatırlayırlar.

Məktəbə alınmış traktorlar, maşınlar, kombaynlar və digər texniki vasitələr məktəbin təcrübə-təlim mərkəzində istifadə edilməklə yanaşı, bacarıqlı sənətkarlara təhkim edilərək rayonun təsərrüfatlarına göndərilirdi. Təsərrüfatlarda məhsul itkisinə yol verməmək üçün məktəbin zonalar üzrə Güləbird, Səfiyan, Qarıqışlaq, Şəlvə və Şamkənddə yaradılan məntəqələrindəki texnikaları vasitəsi ilə əkin-biçin işləri həyata keçirilməsi təmin edilir, təsərrüfatlarla bağlanmış müqavilələrin şərtlərinə uyğun olaraq görülən işlərin müqabilində məktəbin büdcəsinə əlavə gəlir daxil olurdu. Həmin məntəqələr üzrə istehsalat işlərinə cəlb edilən şagirdlər yaşayış yerləri üzrə

seçilir, onlara texnikanın sirləri praktiki öyrədilməklə bərabər, qazanılmış puldan əlavə əmək haqqı ödənirdi.

Respublika Nazirlər Sovetinin qərarına uyğun olaraq hərbi xidməti başa vuran gənclərə yeni peşələr öyrətmək və onların maddi vəziyyətini qismən yaxşılaşdırmaq məqsədi ilə yaradılan qrup (əsgərlik) şagirdlərinə ayda 86-92 manat təqaüdün verilməsi onların maddi durumunu stimullaşdırır, onların rayonda qalıb işləməsinə şərait yaradırdı.



1974-cü ildə Laçın rayonunun yaradılmasının 50 illik yubileyi və rayonun inkişafı ilə əlaqədar Azərbaycan SSR Kommunist Partiyası Mərkəzi Komitəsinin qəbul etdiyi qərar Laçın rayonunun bütün müəssisələrində və təsərrüfatlarında olduğu kimi Laçın rayon kənd 127 saylı orta Texniki Peşə məktəbinin maddi-texniki bazasının daha da gücləndirilməsinə səbəb oldu. Heç təsadüfi deyil ki, ötən əsrin 70-80-ci illərində respublikanın dağ rayonlarında fəaliyyət göstərən Peşə məktəbləri arasında Laçın Peşə məktəbi qabaqcıl Peşə məktəbi hesab edilirdi. 1975-ci ildə məktəbin zonalar üzrə Qarıqışlaq və Şəlvə filialları fəaliyyətə başladı və həmin ərazilər üzrə texnikalar bu mərkəzlərə cəlb edildi. 1978-ci ildə ömrünün 69-cu ilində Əliş müəllim səhhətindəki bəzi problemlərlə əlaqədar öz xahişi ilə Laçın rayon kənd orta Texniki Peşə məktəbinin direktoru vəzifəsindən azad edildi. Onun tövsiyəsi ilə məktəbdə tədris-istehsalat işləri üzrə direktor müavini işləyən

ixtisasca mühəndis-mexanik Qərib Səlimov direktor təyin edildi. Qərib müəllimin məktəbdə direktor işlədiyi 4 il müddətində rayonun təsərrüfatlarının inkişaf etdirilməsi istiqamətində müsbət işlər görüldü. Əsasən Cicimli və Güləbird kənd ərazilərində eksperimental sahələrdə Peşə məktəbinin işçiləri öz texnikalarının köməyi ilə əkin-biçin işlərini həyata keçirərək daha çox məhsul alınmasına nail oldular. Məktəb rəhbərliyi şagirdlər arasında təlim-tərbiyə işlərinin dövrün tələbinə uyğun qurulmasına çalışırdı. Qərib müəllim onun rəhbərliyi ilə məktəbdə pedaqoji fəaliyyətlə məşğul olan Əli Aslanovu, Adil Alıyevi, Səadət Tarıverdiyevanı, Muxtar Zeynalovu, Xanlar Sadıqovu və başqalarını böyük hörmətlə xatırlayır. O, qeyd edir ki, Laçın Peşə məktəbində 70-ci illərdə işləmiş bütün pedaqoji işçilər bu sahədə qazandığımız uğurlara görə Əliş Tanrıverdiyevə borcluyuq. 1982-ci ildə o, Laçın Texniki Peşə məktəbinin direktoru vəzifəsindən azad edilərək başqa sahəyə işləməyə göndərildi. 1982-ci ilin avqust ayında Laçın rayon Partiya Komitəsi Bürosunun qərarı ilə Laçın Texniki Peşə məktəbinin fəaliyyəti yoxlanıldı, direktor vəzifəsinə əvvələr "Laçın" qəzetində redaktorun müavini, Laçın Rayon Partiya Komitəsində şöbə müdiri və Laçın Rayon Nəzarət Komitəsi sədrinin müavini vəzifələrində işləmiş Vaqif Şükürovun namizədliyi tövsiyə edildi. Respublika Peşə Təhsili Komitəsinin sədri Heydər İsayevin əmri ilə Vaqif Şükürov 1982-ci ilin sentyabr ayında Laçın rayon 127 saylı Texniki Peşə məktəbinə direktor təyin edildi. Vaqif müəllim uzun illər Laçın rayonunda rəhbər vəzifələrdə işlədiyi üçün o bütün müəssisələr kimi Peşə məktəbinin də işlərinə bələd idi.

Onun qarşısında duran əsas vəzifə məktəbdə şagird-müəllim münasibətlərini günün tələbləri səviyyəsinə qaldırmaq, mövcud texnikaya komissiyanın iştirakı ilə baxış keçirərək onların sazlığını təmin etmək və güclü maddi-texniki bazaya malik bir məktəbin fəaliyyətini təmin etmək idi. Komissiyanın araşdırmasının nəticəsi olaraq məktəbin Qarıqışlaq və Şəlvə kəndlərindəki filiallarının fəaliyyəti dayandırıldı və kolxoz-sovxozların istifadəsində olan məktəbə məxsus texnikanın həmin müəssisələrin hesabına təmir edilərək Peşə məktəbinə qaytarılması təmin edildi. Müəllimlər arasında dərs bölgüsünə yenidən baxılaraq dərslərin intensiv keçilməsi təmin edildi. Qısa müddətdə məktəbdə çilingər, qaynaqçı, dərzi, toxucu, laborant peşələri üzrə kabinələr, sexlər yaradıldı. Rayonun bəzi müəssisələri ilə və Respublika Təhsil Nazirliyi Təchizat İdarəsi ilə bağlanmış müqaviləyə əsasən hazırlanmış tikiş, toxuculuq məhsulları və digər malların həmin müəssisələrə satışı təmin edildi. Müəllimlərə, şagirdlərə aldıqları əmək haqqı və təqaüddən əlavə pul qazanmaq üçün şərait yaradıldı. İxtisaslı peşəkar kadrlar vəzifələrə irəli çəkildi, bir növ Laçın Peşə məktəbi əvvəlki illərdəki qüsurları geridə

qoyaraq yeni inkişaf mərhələsinə qədəm qoydu. Vaqif müəllimin səyi nəticəsində əhatəsində 1 orta məktəb, 1 uşaq bağçası və Texniki Peşə məktəbi olan restoran bağlanıldı və həmin bina alınaraq Peşə məktəbinin yeməkxanası kimi fəaliyyətə başladı. Məktəbin yataqxanası yeni avadanlıqlar, yataq ləvazimatı ilə təmin edildi. Şagird qəbulu zamanı üstünlük əsasən kəndlərdən gələn gənclərə verilirdi. Beləliklə, Laçın Peşə məktəbi 80-ci illərin ortalarında artıq rayonun təlim mərkəzi olmaqla yanaşı, eyni zamanda xidmət və istehsal sahəsi kimi də fəaliyyət göstərirdi. Məktəbdən kənar tədbirlərin vaxtaşırı keçirilməsində (mədəni-kütləvi, ekskursiyalar) direktorun



müavini Adil Alıyevin, Komsomol komitə katibi Tofiq Abdullayevin zəhməti nəticəsində şagirdlərin əhvali-ruhiyyəsinin yüksək olması təmin edilirdi. Xüsusi ilə kəndlərdən peşə təliminə cəlb edilmiş şagirdlərə yaradılan şəraitin nəticəsidir ki, o dövrdə Laçın rayonundan mərkəzi şəhərlərə və başqa ölkələrə gedən gənclərin sayı başqa regionlardan az olmuşdur. Həmin dövrdə rayonun ziyalılarının övladlarının Laçın Peşə məktəbində təhsil alması isə bu təhsil müəssisəsində təhsilin keyfiyyət göstəricisidir. Vaqif müəllimin səyi nəticəsində (1982-1992) məktəbə 2 ədəd yük maşını, 2 avtobus, 3 ədəd əkin traktoru, 1 ədəd buldozer, ekskavator, 4 ədəd belarus traktoru, 1 ədəd kombayn və çoxlu sayda texniki qurğular alınaraq kollektivin istifadəsinə verilmiş, demək olar ki, məktəbin güclü maddi-texniki bazası yaradılmışdır. Məktəb rəhbərliyinin səyi nəticəsində hər il rayon təsərrüfatlarında məktəb texnikasının gördüyü işlərə görə məktəbin büdcəsinə 100 min manatdan artıq vəsait daxil olmuşdur.

Rayonun Səhiyyə Şöbəsi, Texnika-təminat Birliyi və tikinti təşkilatlarının fəhlə paltarına, yataq dəstinə, kisə, fəhlə əlcəyi və başqa ləvazimata olan tələbatını Laçın Peşə məktəbi ödəyirdi. Bu işlərin görülməsində Nəsibə Həmzəyevanın, Sədaqət Quluyevanın, Nərgiz Bayramovanın, Lətifə Əliyevanın rəhbərlik etdikləri qruplar daha fəal idilər. Heç təsadüfi deyil ki, həmin qrupun şagirdləri o dövrdə respublikada peşə təhsil müəssisələrinin keçirdikləri müsabiqələrdə fəxri yerlər tutardılar. Məktəbin 50 ha təcrübə sınaq sahəsinin 20 hektarında əkilən çoxillik (xaşa) bitkisinin yığılan tonlarla toxumu və əla növ qaba yem sayılan yaşıl kütləsi toplanaraq kolxoz və sovxozlara satılır, əldə edilən pul vəsaitinin bir hissəsi əlavə əmək haqqı kimi işçilərə, şagirdlərə zəhmət haqqı şəklində ödənilirdi. Əldə edilmiş vəsaitin hesabına məktəbin ərazisində dövlət vəsaitindən istifadə etmədən 2 mərtəbəli tədris korpusu tikilərək 1986-cı ildə istifadəyə verildi. Hər ilin yekununa görə məktəbin işçilərinin hər birinə aylıq əmək haqqları miqdarında mükafat verilməsi və Laçın Peşə məktəbinin iş təcrübəsi 1986-cı ildə Respublika Peşə Təhsili Komitəsinin kollegiyasının qərarı ilə respublikanın digər Peşə məktəbləri arasında yayıldı. Məktəbin direktoru Vaqif Şükürova isə “SSRİ-nin Texniki Peşə Təhsili əlaçısı” adı verildi. Laçın Peşə məktəbində təhsil almaq istəyən gənclərin sayının hər il artdığını nəzərə alan məktəb rəhbərliyi, əsasən, əsgəri xidməti başa vuraraq rayona qayıtmış və işsiz olan gənclərdən ibarət ixtisas qruplarının sayını artıraraq onların rayonda qalaraq təhsil almasına və işləməsinə daha çox önəm verirdi. Belə ki, onlar peşələrinə uyğun olaraq istehsalat işlərinə (çilingər, traktorist-maşinist, rabitəçi-montyor, qaynaqçı), rayon rabitə qovşağı ilə bağlanmış müqaviləyə əsasən Qarıkaha kəndinə çəkilən yeraltı kabel xəttinin çəkilişini həyata keçirməyə, rayonun qaz çəkilişi və istismarı idarəsi ilə bağlanmış müqaviləyə görə Xırmanlar kəndinə çəkilən əsas qaz kəmərinin çəkilişinə cəlb edildilər. Bu isə onlar üçün mükəmməl peşə vərdişlərinə yiyələnməklə yanaşı, aldıqları 86-92 manat təqaüddən əlavə gəlir demək idi. Laçın Texniki Peşə məktəbində gənclərin peşə hazırlığının vəziyyəti və bu sahədəki müsbət işlər rayonun o zamankı rəhbərləri və Respublika Peşə Təhsili Komitəsi tərəfindən müsbət qiymətləndirildi. Rayonun N.Nərimanov adına sovxozunun ərazisində 15 ha torpaq sahəsi ayrılaraq 5 milyon manat dəyərində peşə təhsili kompleksi tikilməsi qərara alındı. Laçın rayonu işğal edilərkən artıq bu kompleksdə işlərin 30%-i görülmüşdü.

1992-ci ildə Laçın rayonu işğal edilərkən digər müəssisələr kimi Laçın rayon 127 saylı Texniki Peşə məktəbinin bütün əmlakı Laçında qalmasına baxmayaraq Bərdə şəhərində fəaliyyətə başladı. Məktəb kollektivi həmin dövrdən (17 may 1992) respublikanın 50-dən çox şəhər və rayonlarında

məcburi köçkün həyatı yaşamağa məcbur olması isə, Bərdə şəhəri ərazisində Laçın rayon 127 saylı Texniki Peşə məktəbi kollektivinin yenidən formalaşmasına səbəb oldu. 1996-cı ildə Respublika Təhsil naziri Lidiya Rəsulova Laçın Texniki Peşə məktəbinin əvvəlki illərdəki fəaliyyətini nəzərə alaraq Bərdə şəhər 47 saylı Texniki Peşə məktəbinin ləğv edilərək onun tədris binasının Laçın Peşə məktəbinə verilməsinə nail oldu (Respublika Nazirlər Kabinetinin 23 avqust 1996-cı il 440 saylı qərarı). Laçın rayon 127 saylı Texniki Peşə məktəbi Bərdə şəhərində yeni binaya köçürüldü. 2006-cı ilin iyun ayında Vaqif Şükürov başqa işə keçməsi ilə əlaqədar öz ərizəsi ilə Laçın 127 saylı Texniki Peşə məktəbinin direktoru vəzifəsindən azad edildi. Məktəbə yeni direktor 14 sentyabr 2006-cı ildə Nizami İsmayılov təyin edildi. Nizami müəllim uzun müddət Laçın Rayon Təhsil Şöbəsində məsləhətçi işləyən və təhsil sahəsinə bələd olan bir şəxsdir. O ilk öncə məktəbin maddi texniki bazasını gücləndirərək məktəb kollektivinin yenidən formalaşmasına önəm verdi. Məktəb binasının cari təmir işlərinin aparılaraq yeni invertar və avadanlıqların alınıb gətirilməsinə, gənclərin peşə təhsilinə cəlb edilməsinə çalışırdı. O da başqa işə keçməsi ilə əlaqədar 2008-cı ilin avqust ayında Laçın Peşə məktəbinin direktoru vəzifəsindən azad edildi.



1 noyabr 2008-ci ildə Laçın rayon 127 saylı Texniki Peşə məktəbinə Asif İsayev direktor təyin edildi. Asif müəllim əvvəllər Laçın Rayon Texnika Birliyində, Laçın Rayon Partiya və İcraiyyə Komitələrində işləmişdir. O, 1992-1994-cü illərdə Laçın rayon 127 saylı Texniki Peşə məktəbində direktor müavini və 1993-2008-ci illər ərzində Laçın Rayon Təhsil Şöbəsində işləmiş, peşə təhsili sahəsinə bələd olan bir şəxsdir. Məktəbin yeni rəhbərliyi qarşısında duran əsas vəzifə Laçın Peşə məktəbinin əvvəlki illərdəki müsbət ənənələrinə uyğun olaraq müəllim-şagird münasibətlərini qaydasına qoymaq və yeni şəraitdə vətənpərvər, peşəsini sevən gənclərə Vətəninə, dövlətinə sadiq vətəndaş olmağın sirlərini öyrətməkdir. “Peşə Təhsilinin inkişafı üzrə 2007-2012-ci illər” Dövlət Proqramını əsas götürən Laçın Peşə məktəbinin pedaqoji kollektivi məktəbdə mövcud olan, lakin köhnəlmiş məktəb ləvazimatlarının yeni avadanlıqlarla əvəz olunmasına, məktəb binası ətrafında abadlıq işlərinin aparılmasına və məktəb binasının cari təmir olunmasına nail oldu. Müasir tələblərə cavab verən sanitar qovşağı istifadəyə verildi. Mövcud olan ixtisaslara uyğun məktəb ləvazimatları, dərs ləvazimatları, invertar və avadanlıqlar alınaraq istifadəyə verildi. İşlərində yerli əmək bazarının tələbatını nəzərə alan məktəbin rəhbərliyi müasir peşələr üzrə “Kompüter operatoru”, “Satıcı”, “Əməliyyatçı mühasib” qruplarının açılmasına nail oldu. Gənclər arasında hərbi vətənpərvərlik hisslərini gücləndirmək məqsədi ilə məktəbin həyatində “Şəhidlər bulağı”, istirahət guşəsi istifadəyə verildi və “Laçınlı Milli Qəhrəmanlar” guşəsi təmir edildi.

Vaxtaşırı idman yarışlarının və məktəbdən kənar tədbirlərin keçirilməsi və respublikada tarixi abidələrin zənginliyi ilə seçilən Şəki şəhərinə ekskursiyaların təşkil edilməsi şagirdlərin əhvali-ruhiyyəsinə öz müsbət təsirini göstərir. Qarabağın tarixi və Qarabağ müharibəsi barədə gənclərə mütəmadi məlumatların verilməsi məktəbin hərbi rəhbəri Boris Sadıqovun əsas vəzifəsi hesab edilir. Məzunlarımızdan 47 nəfər Qarabağ döyüşlərində şəhid olmuş və onlardan Qorxmaz Abış oğlu Eyvazov Azərbaycan Respublikasının Milli Qəhrəmanıdır. Nazim Xanlar oğlu Abdullayev isə “Azərbaycan Bayrağı” ordeni ilə təltif edilibdir. Məktəbimizin məzunları Laçın rayonunun idarə və müəssisələri ilə yanaşı, respublikanın başqa regionlarındakı müəssisələrdə etimadımızı doğruldurlar. Məktəbdə peşə yönümlü işlərin (dərslərin) həyata keçirilməsində Elşad Əliyevin, Çingiz Qocayevin, Vahid Cəmilovun, Qəribə Məmişovanın iş təcrübəsi gənc müəllimlər üçün örnək hesab edilir. Laçın Peşə məktəbindəki müsbət dəyişiklikləri və direktorun peşə sahəsindəki təcrübəsini nəzərə alan Laçın Rayon İcra Hakimiyyəti 2011-ci ildə “Gənc nəslin təlim-tərbiyəsi və peşə yönümü” sahəsindəki sə-

mərəli pedaqoji fəaliyyətinə görə məktəbin direktoru Asif İsayevi Laçın Rayon İcra Hakimiyyətinin Fəxri fərmanı ilə təltif edib.

Məktəbimizdə hazırda 150 şagird təhsil alır və onların təlim-tərbiyəsi ilə 36 nəfər rəhbər, mühəndis-pedaqoji və texniki işçi məşğul olur. İşçilərimizdən 31 nəfəri Laçın rayonundan məcburi köçkündür. Məktəbin yataqxanası və yeməkxanası olmadığı üçün şagirdlərə bu xidmətləri göstərə bilmirik. Onlar ayda təqaüdlə təmin edilirlər.

Son illər Respublika Təhsil Nazirliyi tərəfindən məktəbə dərsliklərin (çap və elektron), təlimat və metodiki vasitələrin, invertar və avadanlıqların kifayət qədər verilməsinin nəticəsidir ki, Laçın Peşə məktəbində dərzi, kompüter, mühasibat, çilingər, elektromontyor qruplarında (siniflərində) 12 kompüter, 4 printer-kserekopiya, 11 elektrotikiş maşını və çoxlu sayda digər texniki-elektrik vasitələr şagirdlərimizin istifadəsindədir.

İşğal altında olan rayonlar, xüsusilə Laçın rayonu və onun təbiəti, insanları və adət-ənənələri haqqında şagirdlərimizdə yaratdığımız təəssüratların nəticəsidir ki, məktəbimizdə təhsil alan hər bir şagird tezliklə Laçına getməyə, orada təhsil almağa və işləməyə can atır.



Ümummilli liderimiz Heydər Əliyev Laçın və laçınlılar haqqında demişdir – "Laçın rayonu Azərbaycanın çox gözəl guşələrindən biridir. Gözəl kadr potensialına malikdir. Laçından çoxlu sayda dövlət və elm xadimləri respublikamıza xidmət göstərir".

İnanırıq ki, Azərbaycan Respublikasının Prezidenti, Silahlı Qüvvələrimizin Ali Baş Komandanı Cənab İlham Əliyevin rəhbərliyi altında Laçına qayıdacağımız gün uzaqda deyil.

**Asif İSAYEV,**
***Laçın Peşə məktəbinin direktoru***

**ANIM**

## GÖZÜ YOLDA QALAN DAĞLAR...



Ata, ana, bacı və qardaşlar əzizlərinin itkisi üçün qəmə batarlar, ağlayarlar, sızlayarlar, ah-nalə edərlər, ürəklərinin yanğısını, alovunu bir azca da olsa ovundurmağa çalışarlar. Səbirlə, təmkinlə, yavaş-yavaş, təsəlli ilə dözməyə çalışarlar...

Bəs onda dilsiz, ağızsız dağlar, daşlar neyləsinlər?

Deyirlər, təbii fəlakətlər də təbiətin ah-naləsidir, daşın daşdan ayrılması, qopması, öz yerini dəyişməsi, torpağın bir haldan başqa hala düşməsi, susuzluqdan cadar-cadar olması, parçalanması, od-alovun bütün canlıları yandırıb külə döndərməsi onların pis günlərindən xəbər verir...

Laçın dağlarının ah-naləsindən Həkəri çayı coşaraq qanlı göz yaşları ilə təbiəti islatmışdır, onun qanlı göz yaşları bir il idi ki, qurumaq bilmirdi. Bir ildir ki, Məhəbbət yanğılı səsi ilə vətən həsrətli "Laçınım" mahnısını oxumur, səsi daha dağlara çatmır...

Məhəbbət də Laçından ötəri, dağların, Həkərinin görüşünə getmək üçün 22 il idi ki, ah-nalə edirdi, özünü dağlara, daşlara çırpırdı, "Laçınım, Laçınım" deyib hayqırırdı, yanıqlı-yanıqlı haray çəkirdi, oxuyurdu ki, harayı Laçın dağlarına qədər gedib çata bilsin...

Bu haray düz 22 il idi ki, Məhəbbətin səsində göydəki köçəri quşları da qanad saxlamağa məcbur edirdi. Qanad saxlayan quşlar da bu ah-naləni Laçın dağlarına çatdırırdı. Bəlkə ona görə də dağların bağrı qan olmuşdu, nə yazı yaz, nə də yayı yay idi Laçın dağlarının...

Qırxqız dağları, Kotan qaya 22 il idi ki, bu haraya hay vermək üçün o qədər zirvədən yollara boylandılar ki, gözləri yollara dikili qaldı. Məhəbbətin səsi əks-səda verərək hər dəfə əsən mehin pıçıltısına qarışırdı...

Məhəbbətin "Laçınım, Laçınım" mahnısı könül, ürək işidir. O könül, o ürək ki, gülə, çiçəyə bənzəri var. Onun "Şur"u, "Çahargah"ı, "Mənsuriyyə"si dərdimizin səsli görüntüsüdür.

Bu gündən belə kimlər "Laçınım, Laçınım" mahnısını oxusa da, o haray ta Laçın dağlarına qədər gedib çata bilməz. Çünki 22 il idi ki, o dağlar bu

nəfəsə öyrənmişdi, bu qoxuya alışmışdı... O dağlar ki, 3616 metr dəniz səviyyəsindən yüksəklikdədir.

Dəlidağ silsiləsindən, Nərdivan, Qırxqız sıra dağlarından, Kotan qaya dərəsindən axan saf buz bulaqlardan qidalanaraq Nağdalı, Ələkçi, Şamkənd, Çorman, Piçənis kənd çaylarını əmələ gətirən sular çay qovuşanda Şəlvə çayına qarışır, Həkəri çayına qoşulmağa tələsirdi...

Belə saf su mənbəyindən su içən, gözəl abı-havası olan dağların qoynunda məskən salan, burada doğulan, boya-başa çatan hər bir kəs halal əməyi ilə yaşamağa adət etmişdi. Həmin kəslər həmişə yaxşı işlər, yaxşı əməllərlə məşğul olardılar, əllərindən xainlık, paxıllıq gəlməzdi. Onlar ürəkli, cəsur, əməksevər, istedad sahibi ola bilərdilər...

Şamkənd sovetliyinin Aşağı Çorman kəndində yaşayan sakinlər fərdi təsərrüfatlarında mal-qara, qoyun-quzu saxlamaqla məşğul olardılar. Burada köhlən atı olmayan ailə yox idi, ondan minik və yük tədarükü üçün istifadə edərdilər.

Allahverdi ata ilə Südabə ana xoşbəxt bir ailəyə başçılıq edirdilər. Onların ocağında 4 oğlan, 8 qız dünyaya göz açmışdı. Oğlanları Kazım, Əhliyyət, Qənimət və Məhəbbət idi. Məhəbbət gözəl təbiətin vurğunuydu. Meşəyə gedəndə də, bulaq üstündə də, ov vaxtı da onun məlahətli səsi eşidilərdi. Hər kəs istəyərdi ki, Məhəbbətin oxuduğu nəğmələrə dönə-dönə qulaq assın.

Ailə 1969-cu ildə Laçın şəhərinə köçməli olmuşdu. Məhəbbət burada təhsilini davam etdirmiş, hərbi xidmətə çağırılmışdır.

O, 1977-ci ildə sənədlərini Asəf Zeynallı adına Musiqi Məktəbinə verdi. Münsiflər heyəti bu istedadlı gənc oğlana böyük etimad göstərdi. Məhəbbət Kazımov burada ustadlardan dərs alaraq musiqinin dərin sirlərinə bələd oldu, sonralar ən çox sevilən müğənni kimi şöhrət qazandı.

Görkəmli musiqiçi, Xalq artisti Nəriman Əliyev müsabiqə imtahanı zamanı demişdi ki, "Şur"un, "Cahargah"ın zil pərdəsinə çatanda bəzi müğənnilərin səsində dəyişikliklər yaranır. Bu pərdə Cabbar Qaryağdıoğlu, Xan Şuşinski, Yaqub Məmmədov kimi ifaçılara məxsusdur. Bu pərdədə səsi dəyişməyən istedadlı xanəndələrin sırasına Məhəbbət Kazımovu da şamil etmək olar.

Xalq artisti Ağaxan Abdullayev "İmtahan zamanı tələbələr arasında Məhəbbət Kazımov kimi "Mirzə Hüseyn Segahı"nı oxuyan tələbə olmadı", – deyirdi.

Məhəbbət Kazımovun yoluna can atan müğənnilər var, ancaq "Laçınım, Laçınım" mahnısını Məhəbbət kimi o avazla, o ürəklə oxuya bilməzlər.

Bir dəfə el məclislərinin birində Məhəbbət müəllimə yaxınlaşdım, tanış olduq, xoş arzularımı bildirdim. Həmyaş olduğumuzdan istifadə edərək,

sözarası "Məhəbbət Kazımov laçınlılar üçün gərəkli sənətkardır, sağlamlığınızdan muğayat olun", – dedim.

Qayıtdı ki, "məni yıxsa, elə Laçın həsrəti yıxacaq, qardaş. "Laçınım, Laçınım" mahnısını oxuyanda Məhəbbət olmuram, başqa adam oluram".

"Laçınım, Laçınım" mahnısının sözləri şair Osman Alıyevə, misiqisi isə Məhəbbət Kazımova məxsusdur.

"El məclislərində "Laçınım, Laçınım" mahnısına qol götürüb oynamazlar, həmin mahnı Laçın işğaldan azad olan günə kimi laçınlıların himni olsun", – deyirdi Məhəbbət Kazımov.

Onun bu təklifi çox xoşuma gəlmişdi. Telefon nömrələrini öz xətti ilə mənim "bloknot"uma yazıb dedi ki, laçınlıların toy məclislərində həmişə təmənnasız oxumağa hazıram.

Məhəbbət Kazımovun böyük ürəyi vardı, dostluğa sadiq idi.

Sənət dostları, istedadlı xanəndələrimiz Ehtiram Hüseynov, Habil Laçınlı və qiraət ustası Natiq Dağlaroğlu onun adını daim uca tutur, özlərini böyük sənətkarın mənəvi varisi hesab edərək Məhəbbət Kazımov məktəbinin ənənələrini yaşatmağa çalışırlar.

Məhəbbət Kazımov eldən getdi, ona təkcə laçınlılar yox, bütün azərbaycanlılar yas tutdu.

Dağların gözləri yolda, qulaqları da səsdə qalıb. Ürəyi Laçın dağları boyda, dili "Laçınım, Laçınım" söyləməkdən qabar olan görkəmli müğənni, Azərbaycan Respublikasının Əməkdar artisti Məhəbbət Kazımovun yoxluğu bizləri göynətdi, sızlatdı.

Bir oğlu, iki qızı, oxuduğu bütün mahnıların lent yazıları, bir də son mənzilindəki əzəmətli, daşlaşmış, abidələşmiş heykəli təsəllimiz oldu.

Bunlara da şükür etməli olduq, əlacımız bundan başqa nəyə çatır ki? Gözü yolda qalan Laçın dağlarına nə cavab verəcəyik? Axı dağlar Məhəbbətin yolunu gözləyir, axı dağlar bizim yolumuzu gözləyir...



Görkəmli xanəndə, xalq mahnılarının əvəzsiz ifaçısı Məhəbbət Kazımovun "Laçınım, Laçınım" mahnısı haray qopararaq bizi mübarizəyə, qəhrəmanlığa səsləyir, torpaqlarımızı geri almağa çağırır.

Allah Məhəbbət Kazımova rəhmət eləsin!

**Nemət BƏXTİYAR**

**POEZİYA**

## Məhəmməd HƏSƏNQULİYEV



Məhəmməd Həsənquliyev 1940-cı ildə Laçın rayonunun Qarakeçdi kəndində dünyaya gəlib. 1961-ci ildə Şuşa Pedaqoji Texnikumunu, 1969-cu ildə isə indiki Azərbaycan Dövlət Pedaqoji Universitetinin Azərbaycan dili və ədəbiyyatı fakültəsini bitirib. 1961-1964-cü illərdə Kəlbəcər rayonunda müəllim işləyib.

1987-ci ildə Əməkdar müəllim fəxri adına layiq görülüb. 1988-ci ildə SSRİ Ümumittifaq I Müəllimlər Qurultayının iştirakçısı olub. 1964-cü ildən hal-hazıra kimi Laçın rayonunun Qarakeçdi kənd 1 №-li tam orta məktəbində pedaqoji fəaliyyətini davam etdirir.

### CİNASLI BEŞLİKLƏR

***Doğma kəndimiz Qarakeçdi haqqında***

Gülüstan timsallı kənd Qarakeçdi,
Ağ tale yoluna yüz qara keçdi.
Üstə alov yağdı, son qara keçdi,
Teyləndi yüz barlı ağac budağı,
Sakinləri unutmazlar bu dağı.

Bir dilbər guşəydin dağ ətəyində,
Göz oxşardı başın da, ətəyin də.
Epitetdi sənə zərf də, təyin də,
Gördülər ki, bir yenilməz qalasan,
Qoymadılar görkəmində qalasan.

Qara geyinibdi neçə bulağı,
Sil getsin qaranı, ancaq bul ağı.
Qəbul etmə bu təhnizi, bu lağı,
Namərdliklə sən odlara qalandın,
Kaş yaşaya adın, kaş qala andın.

Qız-gəlin geyimi təmiz və saya,
Gərəkdi kiçiklər böyüyü saya.
Gözəl adətləri gəlməzdi saya,
Davam edir bunlar neçə sənədir,
Fəxarəti mənə, həm də sənədir.

Yaddan çıxarmazdı yoxsulu, təki,
Göz üstə saxlardı balası təki.
Bax bu sifətində qalaydı təki,
Çox heyif ki, indi qəlbi yaradır,
Erməni yüz fitnə-fəsad yaradır.

### VƏTƏNİM MƏNİM

Laləsi, nərgizi, tər bənövşəsi,
Ağappaq suların xoş təranəsi.
Kəkliyin, turacın gözəllik bəhsi,
Kök salıb qəlbimdə bitənim mənim,
"Laçınım, Laçınım – vətənim mənim".

Yaddan çıxmaz Minkənd, Laçın qalası,
Həsrətini çəkir hər bir balası.
Nə vaxtadək tapdaq altda qalası,
Qeyrətə gəl, vətən dərdi çəkənim,
Mən də qürrələnim, sənə güvənim.

Maral Rəhmanzadə fırçayla, rənglə,
Məhəbbət qanadlı sözlə, ahənglə.
Rəsmini, vəsfini yayıbdı elə,
Ey möhtəşəm yurdum, məskənim mənim,
Varlığım, ürəyim və tənim mənim.

Qartallı, şahinli dağlar oğluyam,
Qürbətə düşsəm də, sənə bağlıyam.
Sənsizlikdən, vallah, sinə dağlıyam,
Sənsiz iflic olub qolum, bədənim,
Qəriblikdə ölsəm yanar kəfənim.

Barlı, bərəkətli meyvəli bağlar,
Göylərə baş vuran vüqarlı dağlar.
Varlığıma hopan o xoşbəxt çağlar,
Həsrəti qəlbimi didənim mənim,
Xəyanət əliylə gedənim mənim.

Həkərisi haray salıb çağlayan,
Dağa, daşa çırpılaraq ağlayan.
Matəmgaha dönüb qara bağlayan,
Zülüm ilə bizdən iraq düşənim,
Ayrılığı köksümüzü deşənim.

Min rəhmət diləyək Məhəbbət bəyə,
Gözümün işığı "Vətənim" deyə.
Naləsi, fəryadı yüksəldi göyə,
İşğal altda qəm badəsi içənim,
Nankor qonşu caynağına keçənim.

Bahardır, təbiət üzünə gülür,
Səninsə qüssədən canın üzülür.
Bulaqların göz yaşıtək süzülür,
Nə müddətdir göz önündən itənim,
Olacaqmı harayıma yetənim?!

**NƏVƏLƏRİM**

Babaların yoluxmağa,
Gəlib-gedər nəvələrim.
Hər dəfə müjdə verərlər,
Bu xoşxəbər nəvələrim.

Biri gülümün ləçəyi,
Biri arzumun çiçəyi.
Biri göyçəklər göyçəyi,
Şirin-şəkər nəvələrim,
Parlaq ənvər nəvələrim.

Biri mənim beçə balım,
Biri diləyim, amalım.
Cəminin qadasın alım,
İnci-gövhər nəvələrim,
Gül-nilufər nəvələrim.

Biri mənim tər bənövşəm,
Biri təzə açan qönçəm.
Hər biri bal çəkən beçəm,
Ömrə səhər nəvələrim,
Üzügülər nəvələrim.

Biri təzə-tər səmənim,
Biri gülüm, yasəmənim.
Cümləsi məni sevənim,
İşdə pərgar nəvələrim,
Nəslə sipər nəvələrim.

Biri təravətli yazım,
Biri sevincim, avazım.
Hansınıza dastan yazım,
İnci, gövhər nəvələrim,
Ay bəxtəvər nəvələrim.

**KİTAB RƏFİ**

## XALQ PEDAQOGİKASINA YENİ BAXIŞ

Müasir pedaqogika elminin nəzəri əsaslarının formalaşmasında, onun yeni müddəalarla zənginləşməsində xalqımızın çoxəsrlik tarixə malik müdrik əxlaqi-fəlsəfi baxış və düşüncələri mühüm rol oynayır. Bu mənada ömrünü, gününü balalarımızın maariflənməsinə həsr etmiş sadə kənd müəllimi İsgəndər Səklikovun "Xalq pedaqogikasından bir damla" kitabı ("İsmayıl" NPM, 2010) mövzunun aktuallığı və toxunulan problemlərə yanaşmanın yeniliyi ilə diqqəti cəlb edir. Xalq pedaqogikasını tükənməz bir xəzinə kimi




dəyərləndirən müəllif onun zamanın ağır sınaqlarından keçərək bu gün də yaşayan qiymətli incilərini yeni elmi-metodoloji mövqedən təhlil süzgəcindən keçirir, bu qiymətli milli-mənəvi sərvətlərimizin heç vaxt öz dəyərini itirməməsinin səbəbini də hər şeydən əvvəl özündə ulu əcdadlarımızın zəngin həyat təcrübə və müşahidələrini əks etdirməsi, habelə yüksək tərbiyəvi əhəmiyyətə malik olması ilə izah edir. Müəllif ilk baxışda adi görünən, lakin mahiyyət etibarı ilə çox böyük məna və məzmun kəsb edən konkret nümunələrin təhlili əsasında belə nəticəyə gəlir ki, xalq pedaqogikası əsl tərbiyə məktəbidir və o, zaman-zaman hər azərbaycanlının kamil insan, lə-

yaqətli vətəndaş kimi yetişməsində, yüksək ideallar uğrunda mübarizə aparmasında, eyni zamanda bütövlükdə cəmiyyətin özünün mənəvi-əxlaqi cəhətdən saflaşmasında, onun sağlam və mütərəqqi milli-əxlaqi dəyərlər zəminində inkişafında əvəzsiz rol oynamış, ata-babalarımızın gələcək həyat yoluna işıq salmışdır. Söz yox ki, təkcə təbii kənd mühitində yaşaması deyil, eyni zamanda müasir pedaqogika elminin ən yeni nəzəri konsepsiya və prinsiplərinə dərindən bələdliyi İ.Səklikovun bu mövzuda qələmə aldığı son dərəcə ciddi və sanballı bir tədqiqat əsərinin uğurunu şərtləndirən əsas amillərdəndir. Müəllif tədqiqat boyu folklor nümunələrinə, dini rəvayətlərə, ayrı-ayrı dahi şəxsiyyətlərin fikirlərinə istinad edir ki, bu da kitabın yazılışına bir orijinallıq gətirməkdən əlavə onun oxunaqlığını, effektiv təsir gücünü artırır, oxucunu yormur, irəli sürülən hər bir elmi mülahizə və tezisin əyani şəkildə ifadəsinə kömək edir. İ.Səklikov xalq pedaqogikasına dair elmi araşdırma və qeydlərinə övlad-valideyn münasibətləri, övladın tərbiyəsində atanın mənəvi cavabdehliyi, yaşlı nəslin, dünyagörmüş ağsaqqal və ağbirçəklərin öyüd-nəsihətinin gənclərin həyatındakı mühüm rolu və əhəmiyyəti barədə söhbətlə ("Nənə dilində ata dili dərsi") başlayır. O, dərin ibrətamiz mahiyyət daşıyan atalar sözü və zərb-məsəllərin gerçək həyatda həmişə öz real təsdiqini tapdığını xüsusi şəkildə vurğulayır, ulularımızdan miras qalmış bu qiymətli söz incilərinə biganə qalmağın həmişə şəxsi taleyimizdə ciddi fəsadlar verdiyini, hərəkət və davranışlarımızda islahı çətin olan problemlər yaratdığını nəzərə çarpdırır. Müəllif bu sözlər vasitəsilə diqqəti həm də xalqımızın tarixin ən uzaq çağlarından yüksək mənəvi keyfiyyətlərə, insana və insanlığa xidmət edən etik-əxlaqi norma və prinsiplərə, sivil yaşayış qaydalarına, humanist, mütərəqqi bəşəri dəyərlərə nə qədər böyük önəm verməsinə yönəldir. İ.Səklikov sonrakı söhbətlərində ("Humanizmin pedaqogikası və ya xalq pedaqogikasının humanizmi", "Usta şilləsi", "Söz" və s.) əvvəldə başladığı fikirləri bir növ məntiqi cəhətdən davam etdirir, onu yeni-yeni müddəalarla daha da genişləndirir və dərinləşdirir. Məlumdur ki, cəza və ya tənbeh, bunun tərbiyə prosesindəki rolu həmişə ciddi mübahisə və müzakirələrə səbəb olmuşdur. İ.Səklikov müdrik bir el ağsaqqalı, mehriban və nəvazişkar ata, nəhayət ömrünü, gününü balalarımız arasında keçirən qayğıkeş və tələbkar müəllim kimi özünəməxsus bir tərzdə sözügedən məsələyə ("Cəza, yoxsa tənbeh") münasibətini bildirir, böyüməkdə olan nəslin düzgün ruhda tərbiyə olunmasını əsas götürməklə hər bir yeniyetmənin və gəncin psixika və ləyaqətini zədələməyən, mənəvi-əxlaqi tərbiyəsinə müsbət təsir göstərən "ədalətli cəza"nın tətbiqinə bəraət qazandırır. Əlbəttə, insanı yetkin və kamil bir şəxsiyyət kimi xarakterizə edən mənəvi amillər içərisində iradənin xüsusi yeri var. Ona görə də müəllifin bu mövzu üzərində xü-

susi dayanması ("İradə") təsadüfi deyil. İ.Səklikovun mövzu ətrafında geniş və müfəssəl gəzişmələrdən sonra gəldiyi nəticəyə haqq qazandırmamaq mümkün deyil: "Əsl insanlığa yol mütləq iradədən keçir." Məhəbbət və onun müxtəlif təzahürləri barədə ("Məhəbbət") müəllifin irəli sürdüyü fikirlər də son dərəcə maraqlı və ibrətamizdir. Məhəbbət anlayışı kitabda özünün bütün çalarları ilə dəqiq elmi təhlilini tapır. İ.Səklikovun xalq pedaqogikasının ən ümdə və əzəli mövzularından biri olan Vətən və yurd sevgisi, habelə qəhrəmanlıq haqqında daha vəcdlə, xüsusi bir vurğu və ahənglə söhbət açması ("Vətən haradan başlanır", "Qəhrəmanlıq haqqında üç etüd") söz yox ki, ciddi bir daxili ehtiyacdan irəli gəlir. Müəllif bu gün son dərəcə aktual görünən həmin mövzu ilə bağlı tarixi-ədəbi mənbələr, folklor materialları əsasında öz fikir və düşüncələrini bölüşür, gənclərin hərbi-vətənpərvərlik ruhunda tərbiyə olunmasını pedaqoji ictimaiyyətin, zəngin həyat təcrübəsi olan insanların qarşısında duran ən başlıca vəzifə kimi ön plana çəkir. Həqiqət və yalan, halallıq min illərdən bəri xalqın fikir və düşüncəsini məşğul edən, onun dilində çox tez-tez işlənən əsas məfhumlardandır.

İ.Səklikov düzlük və doğruluğa, halallığa mənəvi-əxlaqi tərbiyənin əsas göstəricilərindən biri kimi çox böyük üstünlük verir, yalanı isə insanı gözdən salan, cəmiyyət arasında ona inamsızlıq yaradan zərərli və islahı vacib olan əxlaqi vərdiş kimi pisləyir ("Həqiqətin yalanı və ya yalanın həqiqəti", "Halallıq"). Kitabda insanın xarakterini təyin edən iradə ("İradə), musiqinin insan mənəviyyatına təsiri ("Musiqi də insanı tərbiyə edir"), insan həyatını zəhərləyən qorxu, şübhə və qısqanclıq kimi neqativ psixoloji faktorlar ("Qorxu, şübhə və qısqanclıq üçbucağı"), insan zəkasının məhsulu olan sənət, elm, eyni zamanda böyük düha sahibləri ("Sənət və elm və ya sənətkar və alim") və başqa məsələlərdən bəhs edən yazılar maraqla oxunur, müəllifin bu məsələlərlə bağlı gəldiyi nəticə və qənaətlər ciddi maraq doğurur. Biz bu kitabı müasir pedaqogika elminin mühüm nailiyyəti hesab edir və onun insan tərbiyəsi ilə məşğul olan hər bir mütəxəssis üçün faydalı ola biləcəyinə ürəkdən inanırıq.

**Sahib İBRAHİMLİ,**
***filologiya üzrə fəlsəfə doktoru,***
***Azərbaycan Dövlət Aqrar Universitetinin dosenti,***
***Azərbaycan Yazıçılar Birliyinin və***
***Azərbaycan Jurnalistlər Birliyinin üzvü,***
***Əməkdar mədəniyyət işçisi***

**İDMANÇILARIMIZ**



## ELTAC HÜMBƏTOV

Eltac Hümbətov 1996-cı il fevralın 14-də anadan olub. Əslən Laçın rayonunun Şamkənd kəndindəndir. Atası və əmisi Qarabağ müharibəsində fədakarlıq göstərmiş döyüşçülər olublar. 2002-ci ildə 145 saylı məktəbdə orta təhsil almağa başlayıb, 2012-ci ildə həmin məktəbi əla qiymətlərlə bitirib. Hələ 11 yaşından Lokomotiv idman klubunda cüdo məşqlərinə başlayaraq 1 il müddətində xırda klublar arasında müəyyən yerlər tutub. Sonra isə atasının və qardaşlarının məşğul olduğu "Kyokuşin karate" idmanına daha çox həvəs göstərdiyindən, atası Ədalət Hümbətovun məşqçiliyi altında kyokuşinka ilə məşğul olmağa başlayıb. Müəyyən vaxtdan sonra "Kyokuşin karate"də uğurlar əldə edib, bu idman növünün qeyri-olimpiya olmasına baxmayaraq, nə qədər çətin olsa da, yolunu davam etdirir. Tam 4 ay məşğul olandan sonra 1-ci klublararası turnirdə 45 kq çəki dərəcəsində Eltac Hümbətov 3 rəqibini məğlub edərək, 1-ci yerə layiq görülür. Eltac bu kimi bir çox yarışlarda birincilik qazanıb, ən pis halda belə qaliblər pilləsində olub. Bəzən birinciliyə yiyələnməməsi onu həvəsdən salmır, daha da həvəsləndirirdi. Nəhayət ki, 14 yaşında Eltac Bakı çempionatında iştirak etdi və 4 döyüşdə də qalib gələrək 1-ci yeri tutdu. 2010-cu il respublika çempionatında yenidən 4 rəqibini məğlub edərək çempion oldu. Eltacın döyüşlərinə kənardan nəzər yetirən rəhbərlər onu 2011-ci il 3-4 dekabrda "Kyokuşin karate" üzrə yeniyetmə və uşaqlararası 1-ci dünya çempionatında ölkəmizi təmsil edən döyüşçülər arasında görməyə qərar verirlər. Həmin çempionatda Eltac holland və rus döyüşçülərini məğlub edərək yarımfinala cıxış mərhələsində yaponiyalı döyüşçü ilə qarşılaşır. 1 raundluq döyüşdə verilən qərara əsasən aktivliyi zəif göründüyü səbəbindən məğlub olur. Həmin ilin sonunda (28-29 dekabr) keçirilən respublika çempionatında 2-ci yerə layiq görülür və vaxtından əvvəl, 15 yaşında ikən, yığma komandanın məşqlərinə çağırılır.



Bir müddət davam edən məşqlərdən sonra Eltac yoldaşlarından seçilməyə can atır və əziyyətlərinin bəhrəsini görür.

2013-cü il iyun ayının 1-2-si İsveçrənin Lüsern şəhərində gənclər və kişilər arasında keçirilən Avropa çempionatında iştirak etməli olan Eltac Hümbətovun sənədində problem yaranır və çempionata qatıla bilmir. Lakin bu da Eltacın əzmini, iradəsini azaltmır, qarşıdakı yarışlara daha həvəslə və qətiyyətlə hazırlaşır. 2012-2013-cü illər Azərbaycan çempionatlarında 65-70 kq çəki dərəcəsində 2 il ard-arda respublika çempionu olur.

2014-cü il may ayının 30-31-də Bakıda keçirilən Avropa çempionatında 28 ölkədən qatılan 500-dən çox döyüşçü arasında Eltac və komanda yoldaşları da vardı. Həmin çempionatda 70 kq çəki dərəcəsində litvalı və polşalı rəqiblərini məğlub edən Eltac yarımfinal mərhələsində bolqar idmançısı ilə qarşı-qarşıya çıxır. Döyüş zamanı ona edilən bəzi haqsızlıqları nəzərə almadan, əzmkarlıqla qalibiyyət haqqında düşünən Eltac Hümbətov qabırğasından aldığı zədələrdən qaynaqlanan ağrılar səbəbindən yarışı başa çatdıra bilmir və 3-cü yerlə kifayətlənir.




2014-cü ilin 8-9 noyabrında Litvanın Kaunas şəhərində keçirilən Avropa çempionatında 2-ci olur. O, bu yarışda da 4 rəqibinin 3-nü vaxtından tez, 1-ni isə 3-cü raundun 8-ci dəqiqəsində məğlub edir (Rumıniya, Litva, Polşa, İsveç).

Final mərhələsində həmyerlimiz Eminlə qarşılaşan Eltac qabırğasından aldığı zədəyə görə bu yarışmada da 2-ci yeri tutur.

22 dekabr 2014-cü ildə 18-35 yaşlı döyüşçülər arasında keçirilən Açıq Azərbaycan Çempionatı bu yaş qrupunda Eltacın ilk yarışması idi. Qazanacağına əmin olan Eltac 4 rəqibinə qalib gəlir. Final döyüşündə isə yenidən Avropa çempionatında məğlub olduğu həmyerlimiz Emin İsmayıllı ilə qarşılaşır və bu dəfə qalib gələrək birincilik qazanır.

**Təqdim etdi: Ramil CƏBRAYIL**

## UNUTMA!

Laçın rayonu 18 may 1992-ci ildə erməni təcavüzkarları tərəfindən işğal edilib. İşğal nəticəsində Laçın şəhərində, Qayğı qəsəbəsində və 125 kənddə olan 13845 fərdi yaşayış evi, 48 sənaye, 63 kənd təsərrüfatı obyekti, 217 mədəni-maarif, 101 məktəb, 5 məktəbdənkənar, 3 məktəbəqədər müəssisə, 142 səhiyyə, 460 ticarət obyekti itirilmişdir.

Qarabağ müharibəsində 333 nəfər şəhid, 225 nəfər əlil olmuş, 33 nəfər hər iki valideynini itirmiş, 5 nəfər Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür. Laçın rayonu işğal edildikdən sonra rayonun 58299 nəfər əhalisi respublikanın 59 rayon və şəhərində müvəqqəti məskunlaşmışdır.




**“Bəxtiyar-4”** mətbəəsinin direktoru: **Bəxtiyar İSMAYILOV**
Kompüter və dizayn: **Araz YAQUBOĞLU**
Korrektor: **Elnur İRƏVANLI**
Operator: **Cəlal ARİFOĞLU**

Yığılmağa verilmişdir: **01.04.2015**
Çapa imzalanmışdır: **24.06.2015**
Şərti çap vərəqi: **6.** Sifariş **№17**
Kağız formatı: **70x100, 1/16**
Sayı: **500.** Qiyməti: **2 AZN**

Dərgi **“Bəxtiyar-4”** istehsal-kommersiya firmasında
hazır diapozitivlərdən çap olunmuşdur.
**E-mail:** baxtiyar54@rambler.ru
**Tel:** (+99412) 568-44-53, (+99450) 570-63-54
**Ünvan:** Bakı, Mir Cəlal 83